*Bu kitab "Mir Möhsün Nəvvab. Divan" (Bakı, "Şuşa" nəşriyyatı, 1999) nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

"Divan"ı və "Məzlumnamə"ni ərəb qrafikasından transliterasiya edənlər: **Əli Məmmədbağıroğlu**
**Arif Ramazanov**

"Elmi, dini, tibbi qeydlər"i farscadan tərcümə edən: **Raqub Kərimov**

**894.3611-dc22**
**AZE**
**Mir Möhsün Nəvvab. Seçilmiş əsərləri.** Bakı, "Şərq-Qərb", 2006, 216 səh.

Olduqca rəngarəng və zəngin bədii yaradıcılığa malik olan Mir Möhsün Nəvvab klassik şerin bütün janrlarında öz qələmini sınamışdır. Yeni qəzəl, rübai, qitə, mürəbbe, müxəmməs, müseddəs, tərcibənd və tərkibəndlər onun "Divan" və "Məzlumnamə"sinin əsasını təşkil edir. "Elmi, dini, tibbi qeydlər" bəhsində M.M.Nəvvabın bu gün də öz aktuallığını itirməyən elmi, dini və tibbi görüşləri qələmə alınmışdır.

Müəllifin klassik poeziya üslubunun qorunmasını təmin etmək üçün apostrof işarəsinin bu nəşrdə saxlanılması məqsədəuyğun bilinmişdir.

**ISBN10 9952-34-057-5**
**ISBN13 978-9952-34-057-0**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**"Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında"**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir

## MİR MÖHSÜN NƏVVAB VƏ ONUN TÜRKCƏ DİVANI

Azərbaycan ədəbiyyatının inkişafında və zənginləşməsində XIX əsr Qarabağ ədəbi mühitinin misilsiz rolu olmuşdur. Bu zəngin mədəniyyət beşiyində çoxlu şair, musiqiçi, tarixçi və gələcək nəsillərə əsərlərini ərməğan qoyub getmiş neçə-neçə sənət dühası yetişmişdir. Bunlardan biri də ensiklopedik biliyə malik şair, rəssam, xəttat, musiqi nəzəriyyəçisi, Azərbaycanın quzeyində kitab çapının bünövrəsini qoyanlardan biri olmuş Mir Möhsün Nəvvab Hacı Mir Əhməd oğlu Ağamirzədədir.

Mir Möhsün Nəvvab 1833-cü ildə Şuşa şəhərində anadan olmuş, bütün ömrü boyu orada yaşamış və yaratmışdır. Təhsilini mədrəsədə alan Nəvvab fars, ərəb dillərini mükəmməl öyrənmiş, sonra isə Molla Abbas Cavanşir Sarıcalı adlı bir müəllimdən dərs almışdır. Fitri istedadı, qabiliyyəti, zəhmətkeşliyi sayəsində riyaziyyat, kimya, nücum (astronomiya), coğrafiya, tarix, musiqi, fiqh və sair elmlərə dərindən yiyələnmişdir. Müəllimliklə məşğul olan M.M.Nəvvab təşkil etdiyi yeni üsullu məktəbdə şagirdlər üçün dərsliklər yazmış, fars dilindən dərs vəsaiti kimi istifadə olunan kitabları tərcümə etmişdir.

Müxtəlif elmlərə bələd və açıqfikirli bir ziyalı olduğu üçün Şuşadan, ətraf kəndlərdən şairlər, musiqiçilər onun mənzilində toplaşar, yeni şeirlərini oxuyar və musiqiyə qulaq asarmışlar. 1872-ci ildə "Məclisi-üns" Natəvanın sarayına köçdükdən bir az sonra Nəvvabın təşəbbüsü ilə "Məclisi fəramuşan" ("Unudulmuşların məclisi") təşkil edilmişdir. Üzvləri isə "Məclisi-üns"ün unutduğu şairlər olmuşdur. Bu məclisdə dövrün tanınmış şairləri ilə yanaşı, Qarabağın məşhur xanəndə və sazəndələri də iştirak etmişlər. Məclisin məşğələləri qışda M.M.Nəvvabın mənzilində, yay aylarında isə Cıdır düzündəki "Ağzıyastı kaha" deyilən yerdə keçirilmişdir. Məclis üzvlərini dünya hadisələri və mədəni yeniliklərlə tanış etmək üçün Nəvvab Bakıdan "Əkinçi", Tiflisdən "Ziya" və "Kəşkül" qəzetlərini, Hindistandan fars dilində nəşr olunan "Həbbül-mətin" məcmuəsini alırdı. Məclis üzvlərinin həm öz aralarında, həm də "Məclisi-üns", Şamaxıdakı "Beytüs-Səfa" məclisi ilə 70-ci illərdə qızğın şeirləşmə getmişdir. Professor N.Axundov yazırdı ki, "Beytüs-Səfa" üzvlərinin



Füzuliyə yazdıqları nəzirələrin keyfiyyətini müəyyən etmək və hansı şerin daha üstün olmasını göstərmək üçün "Məclisi-fəramuşan"ın mühakiməsinə verilir və ondan bir növ arbitr kimi istifadə olunurdu.[1]

1903-cü ildə Nəvvabın təşəbbüsü ilə qiraətxana-kitabxana açılan zaman artıq "Məclisi-fəramuşan"ın fəaliyyəti zəifləmişdi. Qiraətxanaya şairin oğlu Miribrahim (Miriş Ağa) rəhbərlik edirdi. Burda Azərbaycan, Şərq, dünya ədəbiyyatının görkəmli nümayəndələrinin kitabları toplanmış, Nəvvabın səyi sayəsində müxtəlif şəhərlərdən "İqbal", "Şərqi-rus", "Səda", "İrşad", "Molla Nəsrəddin" və sair mətbu orqanlar gətirtdirilirdi. Qiraətxanada yubiley tədbirləri, yeni yazılan əsərlərin müzakirəsi, yazıçı və şairlərlə görüşlər təşkil edilirdi.

M.M.Nəvvabın ən böyük xidməti isə bir-birindən qiymətli elmi, tarixi, bədii əsərləridir. Elmin müxtəlif sahələrini bilməsi nəticəsində "Kəşfül-həqiqə" (3 cilddə), "Bəhrül-hüzən", "Kənzül-mühən", "Vüzuhül-ərqam", "Təzkirə", "Məzamir", "Şəmsül-hidayə", "Şərhi-üstürlab", "500 nəsihət" ("Nəsihətnamə"), "Müseyibnamə", "Ziyaül-ənvar", "Nurül-ənvar", "Erməni-müsəlman münaqişəsi" və sair dəyərli əsərlər yazaraq zəngin bir irs qoyub getmişdir. O, türkcə "Divan"ının dibaçəsində təhsilini başa vurduqdan sonra "Cəfri-camei-mürtəzəvi" kitabını on dörd aya köçürüb Nəsrəddin şah Qacara ithaf etdiyini qeyd etməklə bərabər, şagirdlər üçün dərsliklər yazmaqdan başqa, 21 elmi, bədii əsərin siyahısını da vermişdir. Ümumiyyətlə, Nəvvab 30-dan yuxarı əsərin müəllifidir.

XIX əsrin sonunda onun təsis etdiyi şəxsi mətbəənin Azərbaycan kitab mədəniyyətinin inkişafında böyük rolu olmuşdur. Həmin mətbəədə o öz əsərlərindən başqa, digər şairlərin də əsərlərini çap etmişdir.

M.M.Nəvvabın külliyyatı tam halda bugünkü günədək hələ də çap olunmamışdır. Ancaq əsərlərindən bəziləri ayrı-ayrı dövrlərdə nəşr olunmuşdur.

Ötən əsrin axırlarında Nəvvabın şəxsi mətbəəsində daşbasma üsulu ilə dərc olunanlar bunlardır: "Kəşfül-həqiqə" (fars dilində, I c. – 92 s., II c. – 60 s., III c. – 70 s., 1896-cı il); "Əşar" (türk dilində, 46 s., 1898-ci il; bu kitaba müəllifin oğlu Miribrahim Ağamirzədənin də on bir qəzəli daxil edilmişdir); "Divan" (fars dilində, 148 s., 1897-ci il); "Divan" (fars dilində, 128 s., 1898-ci il).

Bakıda Orucov qardaşlarının "Elektrik" mətbəəsində isə aşağıdakı kitablar əski əlifba ilə nəşr olunmuşdur: "Nəsihətnamə" (türk dilində, 42 s.,

[1] "Şuşa" qəzeti, 29 noyabr 1983-cü il

1912-ci il; naşiri Miribrahim Ağamirzadə, 500 nəsihətdən ibarətdir); "Təzkireyi-Nəvvab" (türk və fars dillərində, 248 s., 1913-cü il); "Məzlumnamə" (türk dilində; 138 s., 1913-cü il); "Vüzuhül-ərqam" ("Rəqəmlərin izahı", 32 s., 1913-cü il).

Son dövrlərdə də M.M.Nəvvab yaradıcılığına diqqət artmış, onun bir çox əsərləri nəşr olunmuş, yaradıcılığı ilə əlaqədar elmi-tədqiqat əsərləri yazılmışdır.[1]

Orta əsrlərdən başlayaraq əski ərəb qrafikalı yazımızın işləndiyi son dövrədək müəlliflərin əsərlərinin köçürülməsi ilə əsasən bu sahənin mütəxəssisi olan katib, xəttat, mücəllid, nəqqaş, miniatürçü rəssam və s. iştirak etmişdir.

Çox az sayda müəllifin əsəri avtoqraf əlyazma kitabı şəklində dövrümüzə gəlib çatmışdır. Lakin M.M.Nəvvab demək olar ki, yazdığı bütün əsərlərini öz dəst-xəttilə köçürərək əlyazma kitabı formasına salmışdır. Beş-altı əlyazmaçı mütəxəssisin kollektiv zəhmətilə yaranan əlyazma kitabını Nəvvab özü hazırlayaraq bu işin öhdəsindən tək gəlmişdir. O, orta əsrlərdə yaranmış Azərbaycan əlyazma kitabı sənəti ənənəsinə sadiq qalaraq poliqrafik qaydalara yerli-yerində əməl etmişdir. Əsərin mətni qara, başlıqlar, yarımbaşlıqlar, seçdirmələr qırmızı mürəkkəblə yazılmış, nəzm əsərləri iki sütunda köçürülmüş, mətnin əvvəlində frontispis çəkərək qızılı, gümüşü, qırmızı, göy və s. rənglərdən istifadə etməklə nəbati naxışlarla əlyazma kitabına bədii tərtibat vermişdir.

M.M.Nəvvabın musiqiyə, rəssamlığa, tarixə, bədii yaradıcılığına aid bir sıra əsərləri hələ sağlığında – XX əsrin əvvəllərində nəşr olunmuş və onlar haqqında sonralar elmi-tədqiqat işləri yazılmışdır. Bədii yaradıcılığı haqqında dərsliklərdə, elmi ədəbiyyatda məlumat verilmişsə də, onun bədii irsini əsasən əks etdirən türkcə "Divan"ı nə sağlığında, nə də sonrakı dövrlərdə işıq üzü görmüşdür. Bu əsər bizə 1894-cü ildə müəllif tərəfindən köçürülmüş əlyazma kitabı şəklində gəlib çatmışdır.

[1] "Nəsihətnamə" (çapa hazırlayanı f.e.n. M.Məmmədova, "Yazıçı" nəşriyyatı, 1987-ci il); "Vüzuhül-ərqam" (çapa hazırlayanı sənətşünaslıq elmləri doktoru Z.Səfərova, "Elm" nəşriyyatı, 1989-cu il); "Avropa musiqi savadı dərsliyi" (tərtibat, farscadan tərcümə, ön söz və şərhlər Gültəkin Şamilinindir, "Şuşa" nəşriyyatı, 1995-ci il); "Erməni-müsəlman münaqişəsi" (çapa hazırlayanlar f.e.n. K.Şərifov, A.Ramazanov, "Şuşa" nəşriyyatı, 1993-cü il); "Təzkireyi-Nəvvab" (elmi redaktorları f.e.d. prof. C.Qəhrəmanov, f.e.n. M.Sultanov, A.Ramazanov; çapa hazırlayanı və ön sözün müəllifi f.e.n. Ə.Bağırov, "Şuşa" nəşriyyatı, 1995-ci il); "Nəvvabın rənglər aləmi" (Ziyadxan Əliyev, "Şuşa" nəşriyyatı, 1996-cı il).



Kitabın poliqrafik, yəni zahiri görünüşünü əks etdirən xüsusiyyətlər belədir: cildi karton olub, kənarına dəri, kötük hissəsinə zərli parça çəkilmişdir. Titul vərəqində üç dairə çəkilərək içərisində əsərin adı, müəllifi və köçürülmə tarixi qeyd olunmuşdur. Mətnin başlanğıcına frontispis çəkilmişdir. Əsər dibaçə ilə başlanır. Burda müəllif özü haqqında bioqrafik məlumat, əsəri yazmağa başladığı tarixi və yazdığı əsərlərin siyahısını vermişdir. Kitabın kağızı 1882-ci ildə Rusiyanın Druşskaya fabrikində istehsal olunmuşdur. Bu haqda məlumat kağızın filiqranlarında əks olunmuşdur. Arabir bəzi vərəqlərdə Rusiyanın ikibaşlı qartal şəkilli gerbi də filiqranda verilmişdir.

"Divan"a müxtəlif janrlarda, məzmunda yazılmış şeirlər daxil edilmişdir. Lakin burda klassik divan tərtibatına, yəni şeirlərin düzülüş qaydalarına əməl olunmamışdır. Divan bir şairin klassik nəzm əsərlərinin müəyyən qayda əsasında tərtib olunmuş mənzumələr məcmuəsindən ibarət olur. Divanda nəzmlər bu qaydada sıralanır: tövhid, münacat, nət, qəsidə, qafiyələri ərəb əlifbasına əsasən düzülmüş qəzəllər, rübailər, qitələr, mürəbbelər, müxəmməslər, müsəddəslər, tuyuqlar, tərcibəndlər, tərkibəndlər. Klassik ədəbiyyatda divan müəllifi olmaq üçün göstərilən nəzm növlərinin mühüm hissəsi ilə bərabər, ərəb əlifbasındakı bütün hərflərlə qafiyəli qəzəllər yazılması əsas şərt kimi götürülmüşdür.[1] Nəvvab isə klassik divan prinsipini pozaraq şeirləri janrına görə ardıcıllıqla köçürməmişdir. "Divan" çapa hazırlanarkən biz də müəllifin əlyazmadakı tərtibat üslubunu olduğu kimi saxlamalı olduq.

M.M.Nəvvabın yaradıcılığının digər sahələri kimi bədii yaradıcılığı da olduqca rəngarəng və zəngindir. O, klassik şerin demək olar ki, bütün janrlarında qələmini sınamışdır. Onda musiqiyə, poeziyaya olan həvəs kiçik yaşlarından başlamış, hələ 13 yaşında ikən yazdığı "Samovarın tərifi" adlı müxəmməsini bütün şeirləri kimi şirin, duzlu və nikbin ruhda yazmışdır. Müxəmməsin məzmunundan məlum olur ki, Nəvvab uşaq vaxtından Azərbaycan milli musiqi alətlərinə (tənbur, ney, ud, saz) və muğamlarımıza yaxşı bələd olmuşdur. Onun samovarın zümzüməsini Şahnaz, Bayatı-şiraz, Şüştər və başqa muğamlara bənzətməsi, həmçinin çayın hər bir içkidən üstünlüyü və onun sağlamlıq üçün nə qədər faydalı olması haqqında yürütdüyü mülahizələr maraq doğurur. Qeyd edək ki, "Divan"a daxil edilmiş bu şeir yeganə əsərdir ki, başqa bir mənbədən – oğlu Miribrahim Ağamirzadənin 1935-ci ildə köçürdüyü əlyazmadan götürülmüşdür.

[1] "İslam Ensiklopediyası". III c., İstanbul, Milli Eyitim Basımevi, 1945, s. 595-596.

"Divan"a şairin lirik, ictimai-siyasi məzmunlu şeirləri ilə yanaşı, müasiri olan Natəvan, Həsənəli xan Qaradaği, Mirzə Ələsgər Növrəs, Bəhram bəy Fədai, Məhzun, Mirzə Əbdül Şahin, Kəminə, Seyid Əzim Şirvani, Mirzə Cəfər Qasımzadə və sairlərinin ona yazdıqları şeirlərə cavabı daxil edilmişdir. Nəvvabın ədəbi əlaqələri Şuşadakı poetik məclislərlə, onun üzvləri ilə məhdudlaşmamış, daha geniş olmuşdur. O, eyni zamanda, ərdəbilli Rüstəm xanın qızı Ziba xanımın, Göyçə sakini cənab Hacı Əli bəy Əmiraslan Ağazadənin, Bursa şəhər sakini Sədrəddin əfəndi Ləmbəraninin xahişilə Osman Paşanın qızı Nigar xanımın şeirlərinə cavab və nəzirələr də yazmışdır.

Demək olar ki, M.M.Nəvvabın elmi, ictimai fəaliyyəti çoxsahəli, zəngin olduğu kimi, bədii yaradıcılığı da geniş, rəngarəng olmuşdur.

86 il maraqlı ömür yolu (1833-1919) keçmiş Mir Möhsün Nəvvab bir-birindən dəyərli, gözəl əsərlər yazaraq mədəniyyət tariximizə töhfə etməsilə bərabər, klassik ədəbiyyatımızın parlaq nümunəsi olub, oxuculara ilk dəfə təqdim olunan "Divan"ı ilə də Azərbaycan ədəbiyyatı tarixində ən yüksək yerlərdən birini tutur.

***Əli Məmmədbağıroğlu***





## DİBAÇƏ

Bismillahir-rəhmanir-rəhim. Yeri və göyü yaradan Allah-təalaya həmdü səna olsun!

Mən, Mir Möhsün Nəvvab *Hacı* Mir Əhməd oğlu *Qarabağın Şuşa* şəhər sakini, hicri-qəməri 1249 (1833)-cu ildə anadan olmuşam. Elə o şəhərdə də boya-başa çatıb, təhsilimi də bu şəhərdə almışam. Oxuduğum zaman riyaziyyat, ədəbiyyat, nücum (astronomiya) və musiqi elmlərini də öyrənmişəm. Xülasə, təhsilimi başa vurduqdan sonra "Cəfri-camei-mürtəzəvi" kitabını on dörd aya köçürdüm. Həmin kitabı Nəsrəddin şah Qacara *ithaf* etdim. Kitabın müqəddiməsində bu barədə məlumat verilmişdir. Kitabda çoxlu cədvəllər var.

Bu kitabı köçürüb qurtarandan sonra şagirdlər üçün fars dilində dərsliklər yazmağa başladım ki, bu kitabları oxuyub feyzyab olsunlar.

Yazdığım kitablar bunlardır:

1. "Bəhrül-hüzən"
2. "Kənzül-mühən"
3. "Məzamir"
4. "Risaleyi-batilüs-sehr"
5. "Vüzuhül-ərqam"
6. "Şəmsül-hidayə"
7. "Şərhi-üstürlab"
8. "500 nəsihət" ("Nəsihətnamə")
9. "Nurül-ənvar"
10. "Təzkirə"
11. "Farsca şeirlər divanı"
12. "Türkcə şeirlər divanı"
13. "Kəşfül-həqiqə", I cild
14. "Məsaibül-əxyar"
15. "Muxtarnamə"
16. "Məzlumnamə"
17. "Kəşfül-həqiqə", II cild
18. "Ziyaül-ənvar"
19. "Kəşfül-həqiqə", *III cild*
20. "Erməni-müsəlman münaqişəsi"
21. "Müseyibnamə"

Bu kitabları yazmaqda məqsədim xalqıma və həmdinlərimə xidmət etməkdən ibarətdir.

Farsca və türkcə "Divan"ımda hər hansı naqisliyə və vəzn pozğunluğuna rast gəlsəniz, üzrlü hesab edin. Mənim əsərlərimi oxuyandan sonra dua etməyi də unutmayın.

Müəllifin xətti ilə bu kitab hicri 1313 (1894)-cü ildə tamamlandı.

## BU, MİR MÖHSÜN NƏVVAB BİN HACI MİR ƏHMƏD AĞAMİRZADƏ QARABAĞİNİN TÜRKCƏ DİVANIDIR

Minnət o xaliqə ki, odur raziqülvəra,
Oldur xudayi-qadir, vəhhabü kibriya.

Həmdü sənavü şükrü sitayiş ovsani'ə,
Yeddi göyü, yeddi yeri eyləyib bəpa.

Dörd rüknü şeş cəhət yaradıb şəmsü həm qəmər,
Səkkiz behiştü yeddi cəhənnəm səva-səva.

Tərh eyləyibdi lövhü qələm nurü həm züləm,
İcadi-cinnü üns edib cümlə masəva.

Yox əqlü fəhmü fikr yolu kəmmü keyfinə,
Yox qüdrətinə kəs söyləyə çünü ya çəra.

Dəryayi-lütfi hər iki dünyada bigiran,
Yox fərqi iltifatına gər şahü gər gəda.

Zillət yüzünü torpağa qoymuş xüzü' ilə,
Sultanü şahü cümlə cahan xiyli-ənbiya.

Dini-mübini üzrə olub daiyi-cahan,
Sərdəftəri-cəmi'yi-rüsul paki-Mustafa.

Övladi-paki yeksərə əshabı ol şəhin,
Olmuş cahanın əhlinə hadiyü pişva.

Nəvvabi-zari ruzi-cəza etmə münfəil,
Yarəb, o şah hörmətinə əfv qıl əta.

* * *

Yox qəmi əl kimsənin kim, dilbəri dilbər ola,
Şöhrəti misli-günəş aləmlərə əzhər ola,
Asiman-hüsn içində bir məhi-ənvər ola,
Rəhmü insafü mürüvvətdə dəxi əşhər ola.

Olmaya kibrü qüruri yarın azar etməyə,
Kəc baxıb, yanə qaçıb hicrə giriftar etməyə,
Aşiqi-biçarəsin aləm-ara xar etməyə,
Meyli-əğyar etməyib, əğyarına əqhər ola.

Nazilə nazik baxanda dinü imanı ala,
Qəmzəsi ahənrüba tək cismdən canı ala,
Bir xumar baxmaqlan İranü Turanı ala,
Əhdü peymanda vəfadarü vəfapərvər ola.

Qəddi-mövzuni ola şümşadü tubayə misal,
Gül yanağı cənnətülmə'vadə hurayə misal,
Xalü xəttü təl'əti firdövsi-ə'layə misal,
Ləbləri gül qönçəsi tək nazikü əhmər ola.

Həlqeyi-zülfi-xəmin bu cismimə cövşən qıla,
Təxti-zərrin vüsala bir zaman huşun qıla,
Külbeyi-əhzanımı yusifsifət rövşən qıla,
Zülməti-hicran içində Xosrəvi-Xavər ola.

Bir bu növ'i dilrüba Nəvvaba gər məqdur ola,
Xaki-payinə əgər canın verə, mə'zur ola.
Qorxum oldur vəsli-naməqdur, özü məhcur ola,
Şeyx Sən'an kimi sirri aləmə əşhər ola.

## MEHDİQULU XANIN QIZI XURŞUDBANU NATƏVAN XANIMA NƏVVABIN YAZDIĞI ŞE'R

Əliyyeyi-aliyə Ağayi-cəlilə,
Nəçün əş'arınız olmaz hüveyda?
Qamu əş'arlar əncamə yetdi,
Sizinkindən əsər olmazmı peyda?

Hilali-nov kimi düşmüş xəfayə,
Xətti-müşkiniz dönmüş hümayə,
Və ya iksirə, ya kim, kimyayə,
Bulunmaz bir əsər manəndi-Ənqa.

Mənim qəsdim budur banuyi-ə'zəm,
Sizin əş'arınız olsun müqəddəm,
Bu namə nami olsun, həm mükərrəm,
Vəgəmə rövnəq olmaz bunda əsla.

Kəlamınız gərək sərdəftər olsun,
Cəvahir nəzminizdən əşhər olsun,
Kütüb təzyinə düşsün, ənvər olsun,
Necə xurşidi-ənvardan bu dünya.

Əya mahi-münəvvər, nəcmi-əşhər,
Cəlalət bürci içrə şəmsi-əzhər,
Cəmalın günbəgün olsun münəvvər,
Tapa mir'ati-hüsnün həm mücəlla.

Günəş ruyin, əya, xurşidi-izzət,
Şərəf bürcündə tapsın övci-rif'ət,
Sizə əhbab olan tapsın səadət,
Mərarət bəhrinə qərq olsun ə'da.

Olubdur müntəzir itmamə əhbab,
Cəvahir nəzmdən olsun şərəfyab,
Sizə peyvəstə daidir bu Nəvvab,
Duadan qeyri yoxdur bir təmənna.



## 1310-CU İLDƏ XAN QARADAĞİ XƏSTƏ OLDUĞU ZAMAN NƏVVABIN ONA YAZDIĞI CAVAB

Bəstəriyəm gərçi bəstər içində,
Vəli bilməm necədi halın, ağa?
Zökəm dögül məni naxoş eyləyən,
Naxoş edib şövqi-vüsalın, ağa.

Fəraqında işim ahü zar olub,
Təni-zarım zarü diləfkar olub,
Görən deyir filanı bimar olub,
Müntəzirəm görəm cəmalın, ağa.

Güllərimi qarğa-quzğun yolubdur,
Bülbülilə qovğaları olubdur,
Xəyalımın gülü yeksər solubdur,
Yetişməsə şəhdi-zülalın, ağa.

Bülbül, yə'ni vəliyyi məcidi-İsadır,
Qarğa-quzğun bid'ət qoyan molladır,
Hara düşsə bunlar cəngü qovğadır,
Bulardandır sənin məlalın, ağa.

Əlhəzər et bu qövmdən hər zaman,
Din rövnəqi pozulubdur bulardan,
Nəvvab edər bu qövmdən əlaman,
Sənin də var belə xəyalın, ağa.

## 1310-CU İLDƏ MİRZƏ ƏLƏSGƏR NÖVRƏS XƏSTƏ YATDIĞI ZAMAN MİR MÖHSÜN NƏVVABIN ONA YAZDIĞI ŞE'R

Ahın, Növrəs, yenə şəbgir olubdur,
Suzi-dildən nədən çəkirsən nəva.
Bulud kimi qəmdən qəlbin dolubdur,
"Üns" əhlindən məgər görübsən cəfa?

Nə olubdur ahü əfğan edirsən,
Qonşuların rahatlığın kəsirsən,
Gərdan olub hər tərəfə gəzirsən,
Bu bitablıq səndə nədir, ey əxa?

Naxoşluğun övd eləyibdir, məgər,
Qızdırmadan yüzündə var bir əsər,
Sənə düşmür, dəxi gəl etmə səfər,
Yatan vaxta orda urubdur hava.

Həkim yoxdur məgər dərdini bilsin?
Hər gün gəlib başın üstün kəsdirsin,
Gah gəlibən, gah da səni güldürsün,
Çarə yoxdur sənə həkimdən səva.

Onlara sən dərdini eylə izhar,
Təbabət etsinlər dərdinə zinhar,
Meyl etgilən şirə-şərbət, hər nə var,
Çəkməyəsən dəxi şurü vaveyla.

Dərdi-dilin dualıq olsa, əgər,
"Fəramuşxanə"yə sən eylə güzər,
Nəvvabınız yazar sənə dualar,
Suyun içən kimi taparsan şəfa.



## NƏVVABIN XAN QARADAĞİYƏ YAZDIĞI CAVAB

Səndən çox intizariydi bu qəlbim,
Şükrüllah, oldu güşad, ay ağa!
Tə'liqiniz vüsul olcaq şad oldum,
Sənsiz olmaq olurmu şad, ay ağa?!

Əldən getdi bu gecə ixtiyarım,
Yarsız oldu yarə dili-fikarım,
Xürrəm keçdi əgərçi ruzgarım,
Sənsiz olmaq olurmu şad, ay ağa?!

Tale oldu şəmsi-işarət bu gecə,
Lame' oldu mahi-izzət bu gecə,
Şərəf buldu nəcmi-rif'ət bu gecə,
Sənsiz olmaq olurmu şad, ay ağa?!

Mənzil əgər behişt ola filməsəl,
Huri kimi yarlar ola bibədəl,
Bülbül təki nitqə gələ hər gözəl,
Sənsiz olmaq olurmu şad, ay ağa?!

Tezliklə özün yetir bu yarə,
Qəlbini qəm oxilə etmə parə,
İşrət günü gər gəlməyə şümarə,
Sənsiz olmaq olurmu şad, ay ağa?!

Qəza yazmış Nəvvabə iftiraqı,
Hər ay nəsib edər ona məhaqı,
Xani-valaya çoxdur iştiyaqı,
Sənsiz olmaq olurmu şad, ay ağa?!

* * *

Nə etmişəm bilmənəm, nigar, sənə,
Olmuşam böylə biqərar sənə.

Etmisən əndəlib tək nalan,
Həsrətəm xarü diləfgar sənə.

Nə gədalar olub sənə müştaq,
Bəndədir şahü şəhriyar sənə.

Olmuşam naləvü fəğana düçar,
Bülbüləm *zari-gül'üzar* sənə.

Qarə geymiş bənəfşə boynun əyib,
O da mən kimi suvgivar sənə.

Gülşənin güllərilə zinət edib,
Oxşadıbdır özün bahar sənə.

O xəttü xalü çeşmi-nərgisi-məst,
Verilib iki zülfiqar sənə.

Etmə Nəvvabdan yüzünü nihan,
Tiri-qəmzən edib şikar sənə.

* * *

Hicrani-yar eylədi halü dilim xərab,
Suzi-dərunim etdi cahan əhlini kəbab.

Könlüm quşunu gör, necə püriztirabdır,
Ol dami-zülfi-ənbərə düşmüş məgər üqab?

Dərdi-fəraqinlə tökər əşk gözlərim,
Mirab nə etdi böylə ki, təqtir edər gülab?

Zahid məni o mahivəş eşqində mən' edər,
Pabənd olur o xalü xətti görsə şeyxü şəab.

Et bərkənar zülfünü ol ruyi-mahdan,
Ta in'fəal eyləyə bir göydə afitab.



Bir qəmzə ilə cilvəgər ol mahvəşlərə,
Ta münfəil olub – deyə, ya "ləyütə"ni türab.

Nəvvabi-zarə eşq yolu münhərif olub,
Nuri-rüxünlə göstər ona bir rahi-səvab.

* * *

Qəmim biyarlıqdan etdi tüğyan,
Yetir Xan Qaradağini, yarəb!
Əritdi cismü canım nari-hicran,
Yetir Xan Qaradağini, yarəb!

Neçə gündür görünməz mahi-novtək,
Bulud tutmuş yüzün, ya kuhi-ətrak,
Olub əğyardan rəncidə bişəkk,
Yetir Xan Qaradağini, yarəb!

Məni salmış bəlayi-nagəhanə,
Özün ünqa kimi çəkmiş nihanə,
Gülüstanda gəlib bülbül fəğanə,
Yetir Xan Qaradağini, yarəb!

Rəqibi-rusiyəh itsin cahandan,
Məni bizar qıldı xanimandan,
Ayırdı cismi-zarı pak candan,
Yetir Xan Qaradağini, yarəb!

Səba, gəl bir güzər qıl kuyi-xanə,
Söylə dərdi-dilimi yanə-yanə,
Nədir bu nazü qəmzə, bu bəhanə,
Yetir Xan Qaradağini, yarəb!

Gəl et Nəvvabına bir dəm nəzarə,
Fəraqında olan zarü fikarə,
Vüsalındır onun dərdinə çarə,
Yetir Xan Qaradağini, yarəb!

## NƏVVABIN XAN QARADAĞİYƏ YAZDIĞI CAVAB

Mənsiz nə lazımdır seyranə çıxmaq,
Dağü bağda əgər ki, çox gül açıb.
Bahar olub hər küncdə, bilirəm,
Əlvan-əlvan süsənü sünbül açıb.

Bülbüllərin səsi dünyanı alıb,
Qəlbim gülü, leyk saralıb-solub,
Bulud kimi məlalü qəmdən dolub,
Didələrim hər tərəfə seyl açıb.

Nə qıza meylim var, nə də gəlinə,
Nə qəddinə, qamətinə, telinə,
Nə yüzünə, dodağına, dilinə,
Yanaqları əgərçi gül-gül açıb.

İncimişəm bu dünyada hər nə var,
Ruhanilər qəlbim edib tarü mar.
Səfa yoxdur, bu qövmdə cəfa var,
Hər biri bir baydax gülgül açıb.

Təhtül-hənin salıbdılar gərdənə,
Tərtib edib meysərevü meymənə,
Tor qurarlar hər gələnə, gedənə,
Bid'ət salıb nəf'inə dil açıb.

Bu qövmdən, xana, sən eylə həzər,
Nəvvabdan eşit, olma dərbədər,
Bir ağacdır bular ki, verməz səmər,
Budaxları şərrlə xinbəl açıb.



* * *

Qərqi-dəryayi-qəm oldum, ey xudaya, dadə yet,
Qüssədən gül tək saraldım, ey xuda, fəryadə yet.

Qönçə tək qan oldu bağrım gülüstani-dəhridə,
Gül kimi pəjmürdə oldum, ey xudaya, dadə yet.

Bülbüli-şeyda kimi nələm cahanı çulğadı,
Gül səfasın görməmiş öldüm, ey xuda, fəryadə yet.

Badə vəslilə sərşar olmadım sağər kimi,
Əşki-xunin ilə doldum, ey xuda, dadə yet.

Bir gülüzlü yar vəslin görmədim Nəvvab tək,
Cövri-əğyar ilə soldum, ey xuda, fəryadə yet.

* * *

Qəmi-hicrində bimarəm mən, ey dost!
Zəlilü acizü zarəm mən, ey dost!

Gecə-gündüz çəkib rəncilə zəhmət,
Gözümdə uyqu yox, bidarəm, ey dost!

Cəhanın əhlinə çox-çox əzizəm,
Hüzurunda neçün bəs xarəm, ey dost!

Sənin eşqində, ey şuxi-dilaram,
Fəğanü ahilə xunbarəm, ey dost!

Qalıb Mənsur tək dari-sitəmdə,
Həyatımdan belə bizarəm, ey dost!

Olubdur bülbüli-şuridə Nəvvab,
Giriftari-qəmi-didarəm, ey dost!

* * *

Genə ol şəmsi-rüxsarın olub pünhan, nədir bais?
Bulud altda gəzər hər yan, edər seyran, nədir bais?

Münəvvər eyləyir nuri-rüxündən aləmi rövşən,
Olubdur feyzbəxş aləmi-imkan, nədir bais?

Çəkər gül intizarın bülbüli-şuridə hər ləhzə,
Nəsibi-xar olur, leykən güli-bustan, nədir bais?

İçər dəryayi-bipayəndən əğyarlar daim,
Vəleykən təşnələblər can verir ətşan, nədir bais?

Xəzanın sərsəri etmiş gülü gülzarı pəjmürdə,
Səpər peyvəstə xaristanə su-nisan, nədir bais?

Məcalisdə qalır azadələr çün surəti-bidəm,
Çapar nixvət atın, nakəs edər hədyan, nədir bais?

Nə bilməz adəti-dini, nə də ayini-ürfanı,
Deyər ki, burda mən, Bağdadda kor xan, nədir bais?

Nə bilməz məclis əhvalın, nə anlar bir kəsin şənin,
Nə qanmaz əhdü misaqı, nə də peyman, nədir bais?

Böylə mərdudə möhtac eyləmə, yarəb, məxluqi,
Bulara qismət et imanü ya niran, nədir bais?

Əta qılsan nolur Nəvvabə nuri-ruyi-pakindən,
Əgər bir zərrə ta təb'i ola rəxşan, nədir bais?

* * *

Eşqim olubdu yar hüzurində narəvac,
Yarəb, bu dərdimə sən özün etgilən əlac.

Hicran qəmilə gərçi olub tirətər günüm,
Vəslin xəyali könlüm edər xeyli ibtihac.



Hər ləhzə odlaşıb yanaram suzi-eşqidən,
Sənsiz bana nə lazım olub dibavü dəvac.

Bir ləhzə şad görməmişəm qəmli könlümü,
Dərdin olub əzəl güni canilə imtizac.

Nəvvabi-zar qəlbini sındırma, ey gözəl,
Mümkündü ittisalı şikəst olsa gər zücac.

* * *

Aşiqin qanı əgər olsa mübah,
Aşiqi-zarə olur eyni-səlah.

Hicri-ruyində olub tirə günüm,
Mahi-ruyindi bana şəmsi-səbah.

Dami-giysuyə düşüb mürği-rəvan,
Ta qiyamət bilirəm, yoxdu nəcah.

Sənin eşqindi bana ruzi-qiyam,
Əlomü möhnət üçün fövzü fəlah.

Sənsiz, ey dost, bana zar keçər,
Çəkərəm ahü nəva, şamü səbah.

Tökgilən qanını sən Nəvvabın,
Xaki-payinə ola qanı mübah.

* * *

Gülşəni-ruyində bismil bülbüli-şeydayə bax,
Bəzmi-eşq içrə sınan bu sağərü səhbayə bax.

Ey məni mən' eyləyən, zahid, gəl indi seyr qıl,
Yarımın qəddini gör, get xüldədə tubayə bax.

Əşki-çeşmim həsrəti-ruyinlə nisanə dönüb,
Baxma dürrü yaquta bu lö'löi-lalaya bax.

Leyliyi-dövran sənsən, mən də Məcnuni-zaman,
Gərçi sən Şirinsən, bu kuhkəni-rüsvayə bax.

Göz yaşım ümmanə dönmüş hicri-ruyi-yarda,
Seyr qılmaq xahiş etsən, mövc uran dəryayə bax.

Aşiqi-sadiq olan vəsl istəsə candan keçər,
Gəştikani-eşqdən məmlov olan səhrayə bax.

Həsrəti-ruyinlə canın tapşırıb Nəvvabi-zar,
Eşq sevdasında bir şur etməyən bipayə bax.

* * *

Hər zaman gül yüzünü mürği-rəvan eylər yad,
Bülbülü bismilü şuridə kimi eylər dad.

Sənin eşqində mən, ey şəkkərü şirin hərəkat,
Çaparam dağı, daşı necə çapıbdır Fərhad.

Gecələr əşki-qəmə qərq oluram sübhə kimi,
Sübhlər şamə təki eylərəm ahü fəryad.

Mən necə şad olub meyli-gülüstan edim,
Xaneyi-səbrimi hicranın edibdir bərbad.

Eşq oduna o zamandan ki, düşübdür Nəvvab,
Olmayıb bircə zaman möhnəti-qəmdən azad.

* * *

Ey ləb, lə'lin ləbimdə şirü şəkkər tək leziz,
Şərbəti-abi-dəhanın abi-kövsər tək ləziz.



Hüqqeyi-mərcanü mirvaridir təngi-dəhan,
Nöqteyi-mövhumdur qəndi-mükərrər tək ləziz.

Cə'di-zülfün səfheyi-rüxsarə yazmış, ya Əli,
Xali-hindu guşeyi-ruyində qənbər tək ləziz.

Hadiyi-zülmatdır rüxsari-mahın hər zaman,
Eşq gümrahinə həm şəmsi-münəvvər tək ləziz.

Qaşların taqi nə xoş mehrabdır sacidlərə,
Zahidü ibad üçün həlvayi-şəkkər tək ləziz.

Cilveyi-nuri-rüxün Nəvvabə olmuş qibləgah,
Tövhi-kuyin Kə'bəyü beyti-mütəhhər tək ləziz.

* * *

Əvvəl ol dadarın adına ki, oldur dadgər,
Xaliqi-ərzü səmavü sane'i-cinnü bəşər.

Abü xakü atəşü badi odur icad edən,
Əhsənüt-təqvimdə insanı etmiş cilvəgər.

Tuti-təb'im səməndər kimi yanmış atəşə,
Şəkkərin küftarə xu etmiş, yenə istər şəkər.

Bir güləndamın bu gün sövdası düşmüş başına,
Yə'ni bir insani-kamil surəti şəmsü qəmər.

Səbri-bünyadımı hicranı edibdir tarü mar,
Xaneyi-təşkibimi şövqi edib zirü zəbər.

Ey nigarım, gül'üzarım, novbaharım lütf qıl,
Guşeyi-çeşminlə bir Nəvvabına eylə nəzər.

Həsrəti-ruyinlə Sən'an kimi düşmüş çöllərə,
Vəslətin şurilə Məcnun kimi olmuş dərbədər.

Nuri-ruyin çünki le'man oldu Turi-eşqidə,
Tutmadı heç aşiqin canı bənim kimi şərər.

Rözeyi-rizvandı veslin ləzzəti hər ləhzədə,
Dərdü hicrü firqətin hər dəmdə çün nari-seqər.

Şəmsi-ruyin leyli-muyində nihan olcaq yə'qin,
Müztərib pərvanə tək ruhum urar hər yanə sər.

İltifatın şamil et Nəvvabə ruzi-rəstaxiz,
Et şəfaət cənnətül məvada ta tutsun məqərr.

* * *

Vahəsrəta ki, oldu günüm ahü zarlar,
Gülzardan çü çəkdi ayaq gül'üzarlar.

Vafirqəta ki, gəldi xəzan, keçdi novbahar,
Qan ağla, gözlərim, necə əbri-baharlar.

Odlaşdı firqətində Səməndər təki bu can,
Ol nardan alışdı qamu kuhsarlar.

Künci-cəfada bayqu kimi ahü zarilən,
Sənsiz necə keçirdim əbəs ruzgarlar.

Olmuş əsir o türreyi-tərrarə, ey əcəb,
Min zəxmdar mən kimi nalan şikarlar.

Əldən o vaxtdan ki, çıxıb daməni-vüsal,
Xunbar gözlərim olub əncümşümarlar.

Badi-səba, yetir o gül əndamın ətrini,
Et bir savab, eyləgilən mişkbarlar.

Nəvvabın əlləri yetə gər bir də vəslinə,
Ta həşr olunca eyləməz o ahü zarlar.



* * *

Ey dil, bu dilbərin nə gözəl xəttü xalı var,
Bu sərvi-qədü işvəkarın xoş camalı var.

Gər ahu gözlü, söyləyim eyni-xətadı bu,
Dəşti-xutən nə vaxt bunun tək maralı var.

Dövri-rüxində zülfi müənbər şikənləri,
Guya ki, gündü dövrü bərində hilalı var.

Şirin ləbində cuyi-şəkkər təşnə kuhkən,
Qəlbində kuh-kuh bu dərdin məlalı var.

Əbruyi-qövsi, xalü xəti, mahi-təl'əti,
Can almağa bu hər birinin bir məqalı var.

Ahu kimi rəmidələnir, gah ram olur,
Bu gülşənin nə nazlı cəmilə qəzali var.

İnsafı yox, mürvəti yox, zülmü çox munun,
Bu rəhzənin nə çox qoşunu, çox cəlalı var.

Nəvvab ahü nalə edər, səngdil gülər,
Bu gülməgin, bu ağlamağın özgə halı var.

* * *

Fəraqi-ruyi-mahində fəğanü zarü ahım var,
Nə bu dərd içrə bir munis, nə bu ğəmdə pənahım var.

Məni bu dərdü hicranə salan əğyardır, billəm,
Vəgərnə yar yanında, nə bir zərrə günahım var.

Görəndə şəm'i-rüxsarın yanar pərvanə tək cismim,
Şüa' ruyinə, ey məh, duai-sübhgahım var.

Nə yadımdan çıxar hər dəm, nə yadına salar bir dəm,
Mənim üşşaqilər içrə nə bədbəxt siyahım var.

Qəmində süvgivarəm mən, vüsalə biqərarəm həm,
Yetiş fəryadıma, ey məh, sənin tək padşahım var.

Əlimdə eşq tuğrası, sərimdə yar sövdası,
Nə qəm, məhşər günü, yara, sənin tək dadxahım var.

Səri-kuyində, cana, binəvasan, sanma Nəvvabı,
Qəmü dərdi-məlalü rəncdən çox-çox sipahım var.

## MÜRƏBBE'

Bir nigarı istərəm aləmlərin ə'lasıdır,
Ruzgarın bağı içrə novgüli-rə'nasıdır,
Can ona qiymət degil, qiymətlərin ədnasıdır,
Çünki bu sövdayi-kamili-gülruxan sövdasıdır.

Nazilə nazik baxanda dinü imanı alır,
Qəmzəsi ahənrüba tək cismdən canı alır,
Qiyməti-lə'li-ləbi İranü Turanı alır,
Çünki bu sövdayi-kamili-gülruxan sövdasıdır.

Xalü xəttü təl'əti firdövsi-ə'laya dəgər,
Qaməti-şümşadi min-min sərvi-tubaya dəgər,
Zülfünün hər tarı yüz Leylavü Əzrayə dəgər,
Çünki bu sövdayi-kamili-gülruxan sövdasıdır.

Zahida, bu biz degil kim, əlli qat başa qoyub,
Şiydü salusi ilə biçarə əvamı tovlayub,
Ac qurd kimi cəmi'ən pul, malını soyub,
Bəlkə bu sövdeyi-kamili-gülruxan sövdasıdır.

Yox məlaməti-aşiqi-biçarə gər candan keçə,
Bir belə canan yolunda xanimandan keçə,
Bu degil halva ki, molla dinü imandan keçə,
Bəlkə bu sövdayi-kamili-gülruxan sövdasıdır.

Bu degil yaqutü almasü zəbərcəd zivəri,
Hər dənizadə alıb zinət, verə duşü bəri,



Bu gedil dinarü dirhəm kim, yığa hər sərsəri,
Bəlkə bu sövdayi-kamili-gülruxan sövdasıdır.

Yoxdur insafı sənə, Nəvvab bir etməz nigah,
Bülbüli-şeyda kimi gər edəsən əfğanü ah,
Kə'bəyi-kuyində ömrün mayəsin etsin təbah,
Çünki bu sövdayi-kamili-gülruxan sövdasıdır.

## NƏVVABIN MİRZƏ ƏLƏSGƏR NÖVRƏSƏ 1309-CU İLDƏ YAZDIĞI MÜRƏBBE'

Növrəs, nə yatıbsan qəflət içində,
Ağırlaşıb gözün qanə dönübdür.
Bahar olub məgər yoxdur xəbərin?
Səthi-cahan gülüstanə dönübdür.

Xəl'ət geyib zümrüddən ağaclar,
Çiçəklərdən boynun əyib budaqlar,
Şəbnəm düşüb təzələnib yarpaqlar,
Səthi-cahan gülüstanə dönübdür.

Açılıbdır bağda gülü lalələr,
Dəstə bağlar güli gözi alələr,
Bülbül kimi oxur xırda salələr,
Səthi-cahan gülüstanə dönübdür.

Cəh-cəh vurər bülbül çəmən içində,
Səmən bular, yatıb səmən içində,
Əqiq kimi kani-Yəmən içində,
Səthi-cahan gülüstanə dönübdür.

Seyr eyləyir səhrələrı məhrular,
Tel-tel olub gül yanaqda giysular,
Qumru çəkər ağaclarda yahular,
Səthi-cahan gülüstanə dönübdür.

Yelpəkləyir badü bahar üzlərin,
Xumarlanıb yumur nərgis gözlərin,

Şəkər kimi şirin edir sözlərin,
Səthi-cahan gülüstanə dönübdür.

Şuru düşüb məhruların cahanə,
Nazlar satar naziklərə şahanə,
Düşməz ələ, Növrəs, belə bəhanə,
Səthi-cahan gülüstanə dönübdür.

Bu məhvəşlər qoynu cənnət bağıdır,
Həm sineyi-simi bustan tağıdır,
Şamamasın üzüb, dərmək çağıdır,
Səthi-cahan gülüstanə dönübdür.

Gülüstanı gül ləşkəri alıbdır,
Ahü əfğan bülbüllərə qalıbdır,
Sün'i-Yəzdan fərşi-əlvan salıbdır,
Səthi-cahan gülüstanə dönübdür.

Nə mürvətdir bu mövsümdə cəmlənib,
Bayqu kimi günəş yüzdən gizlənib.
Çiçəklərdən, güldən dünya düzlənib,
Səthi-cahan gülüstanə dönübdür.

Təsbih edir xaliqinə ağaclar,
Zikr eləyir əfğan edəndə quşlar,
Zahir edir sane'in dağlar, daşlar,
Səthi-cahan gülüstanə dönübdür.

Bu aləmdə yoxdu zövqü səfalar,
Gülruxlardan kimlər görüb vəfalar,
Xəzan yetər, hatif çəkər sədalar,
Səthi-cahan neyistanə dönübdür.

Nəvvab, qıl şükr xudanı izhar,
Sün'ətə bax, sane'ətə pey apar,
Zahir edir cilvəsini bu asar,
Səthi-cahan gülüstanə dönübdür.



## "MƏCLİSİ-ÜNS"ÜN İŞTİRAKÇILARINA

Ədalətli olan məclis, yetin imdadıma bir dəm,
Bu bipərvayə əmr eyləyin, bu nə şurü, nə qovğadır.

Xəyalım söyləyir hər dəm mənə, key aşiqi-bidil,
Gəhi adım qoyar qumri, gəhi söylər ki, şeydadır.

Əgər mən aşiqi-zarəm, mənə mə'şuq olan kimdir,
Mənə bu sözləri bağlar, bu nə növ' müəmmadır.

Yetişdi sinnimiz sittinə, leykən bir usanmaq yox,
Bu nə şurişdi kim, salmış bu aləm içrə peydadır.

Məni yoldan iraq eyləyib, gəhi min nazla söylər
Ki, yarın qəddi-zibası qamu ne'mətdən üzmadır.

Behişti axtaran kəslər, cinanə meyl edənlər həm,
Nigarın xalü xəti, təl'əti firdövsi-ə'ladır.

Gəhi ol taqi-əbrusun edir taat üçün qiblə,
Həcr xali, ləbi Zəmzəm, səri hər sirrə daradır.

Gəhi nisbət verir yarın qəddini nəxli-tubayə,
Gəhi sərv, gəhi ər'ər, gəhi şümşadə həmtadır.

Gəhi eyləyir məni Məcnun, xəyalım gəh divanə,
Bihəmdüllah nə Məcnunam, nə fikrim vəsli-Leyladır.

Məni rüsva edibdir bu pərişan güftəgu yeksər,
Yenə fikrində Vamiqdir, yenə zikrində Əzradır.

Yə'qin meyl etmənəm o nərgisi-xümmarə, gər etsəm,
Təni-lərzim rüxi-zərdimdən, əlbəttə, hüveydadır.

Nigarım, novbaharım, gül'üzarım söyləyir hər dəm,
Nigarım kimdi, yarım kim, baharım nərdə peydadır?

Hanı Kə'bə, hanı Zəmzəm, Həcər qanda nümayandır?
Hanı ol sevdiyim yarın vücudi, yoxsa Ənqadır?

Hanı Leyla, hanı Əzra, mənim onlara nə dəxlim,
Nədir hallay-bullay sözlər ki, bu zalimdə inşadır.

Bu nə xəlvət, bu nə şahid, bu nə saqi, nə peymanə,
Nə böhtandır mənə söylər, bu nə ziştü, nə zibadır.

Belə işlər büruz etmiş nə vaxta məndən, ey yaran,
Yetin imdadıma, bunlar nə sövda, nə səfradır.

Nə bəngə, çərsə mö'tadəm, nə tiryak atmanam, billah,
Bu hədyanlar xəyalıdır başımda, bu nə sövdadır.

Bu nə şuridəlikdir kim, məni salmış bu aləmdə,
Həsən kəşf eyləsin bu sirri, gər əsrarə danadır.

Məmayi lütf edib, imdadə gər yetsə, kərəm eylər,
Böylə hikmətlərə billəm Cənabi çox təvanadır.

Əgər Agah məni agah edə bu sirri-pünhanə
Ki, bu əsrari-pünhanlar nə gənc içrə hüveydadır.

Bu nə ruyi-mütəhərrirdir, bu nə muyi-müənbərdir,
Nə qamətdir, qiyamətdir, nə gözlər məhz şəhladır.

Təcəllayi-rüxi-paki edib müdhüş Nəvvabı,
Böylə kim, heç bilməz bu nə Sinadır, nə Musadır.

## "MƏCLİSİ-FƏRAMUŞAN"IN ÜZVLƏRİNƏ İKİNCİ ŞİKAYƏT

Xəyali-hazirə bir əmrü bir nəhy olmadı, yaran,
Mənim odlara yanmağım sizin halə nə müsradır.

Yığıbdır başa o başı edir hər bir xəyal etsə,
Qılır aləmləri bərhəm, bu nə kibrü tərsadır.



Əgər şahid sizə lazımdı, çox-çoxlu güvahım var,
İqamət eyləyim bir-bir əminlərdir, nə molladır.

Güvahım şəm'dir, pərvanədir, həm arizi-zərdim,
Yenə məcruh çeşmimdir ki, hər dəm əşki-paladır.

Yenə şahid varımdır kim, biri Sabit, biri Səyyar,
Dəxi şahidimə taban, dəxi əqdi-Süreyyadır.

Biri Xan Qaradaği, biri Baki şuridə
Ki, onlar da mənim kimi xəyalə bəndi-bərpadır.

Biri Mirzayi Növrəsdir ki, o vaqifdir əsrarə,
Xüsusən böylə işlərdə Cənabi xeyli danadır.

Girim mehrabi-əbruyə, urum əl Müshəfi-ruyə,
Xəttü xalü siyah muyə ki, Tahavü Fəthnadır.

Qəsəmlər eyləyim gülgun yanağa, nərgisi-məstə,
Birisi qəmzeyi-məxmuri, biri Kəşşəmsi-beyzadır.

Mühəqqəq oldu çün bu şəkvələr ol bəzmi-ürfanə,
Siyasət eyləyin dərdim ki, bu özgə də'vadır.

Çəkin zənciri-zülfə, boynunu həm payi-bənd eyləyin,
Salın çahi-zənəxdanə ki, o bir təngi-mə'vadır.

Əgər imdadə yetməklik sizə lazım degil, yaran,
Nə vacibdir, nə sünnətdir həmin qövli-bicadır.

Edin mə'lum ta beytüssəfayə eyləyim şikvə,
Deyirlər kim, ədalətdə səfa əhli müsəffadır.

"Fəramuşan"da "Üns" əhli qoyub məzlum Nəvvabı,
Xəyalimlə cədəl eylir ki, qövlün cümlə bicadır.

## BƏHRAM BƏY FƏDAİNİN TƏ'RİFİ

Əya Bəhrami-zil-əkrəm, mü'in olsun sana davər,
Cəlalını cəlil etsin, cəmalını məhi-ənvər.

Şikarın tiri-xahişlə həmişə xarzar olsun,
Necə Bəhrami-Gurə seyidlər məğlubdur və məqhər.

Sənin səhmin ola üdvanə müsri daima nafiz,
Necə Bəhram pəncəsindən qamu əflakilər titrər.

Dərində cümlə hasidlər qulami-kəmtərin olsun,
Necə Bəhrami-çubinə dərində bir bölük ləşkər.

Nə layiqdir səni nisbət verəm fərzanə Bəhramə
Ki, şə'nin ondan üzmadır, məqalatındı həm şəkər.

"Fəramuşan"ın əhlinə olubsan hübbilə həmdəm,
Olar gər qütbdür, leykən cənabindir dəxi mehvər.

Biri Xan Qaradaği ki, şə'ni alidir ali,
Onun həm şə'ni, həm şe'ri "Fəramuşan"dadır əşhər.

Biri Mirzayi-Növrəsdir ki, pirandır xəmuşanə,
Odur əş'ar aləmində qamu şairlərə rəhbər.

Əli ət-təxsis Baki kim, odur əş'arda dana,
Ona təqlid lazımdır, dəraviş əhlinə yeksər.

Fədayi, sən vəfalı, bivəfalıq səndə yox əsla,
Vücudun sırf ünvandır, ümumi-şe'rə həm məzhər.

Sənin mədhin gərək şə'nin kimi ətvəl ola, amma
Məni mə'zur tut kim, üzrlə oldu belə əqsər.

Sənə Nəvvab daidir, sənin mədhində saidir,
Fəramuş etmə xatirdən, odur övladi-peyğəmbər.



* * *

Saqi, yenə başda bu sövda nədir?
Şur düşüb aləmə, qovğa nədir?

Yoxdu dəva aşiqi-biçarəyə,
Olsa da gər bir neçə peymanədir.

Məstü xərab eyləgilən, bilməyim,
Badə nədir, saqiyü səhba nədir?

Yoxdu xərabata yolum ta gedim,
Məscidə qoymazlar ki, viranədir.

Yar yenə cilvə edib aləmə,
Cümleyi-əşyadə hüveyda nədir?

Ənfəsü afaqa təcəllası var,
Turda Musaya təcəlla nədir?

Cilvəsi əşyalara gər yetməyib,
Sərvdə bu qamətü bala nədir?

Zülmətü nur içrə nümayan olan,
Zərreyi-xurşidə peyda nədir?

Cilvəsi məhrulara gər yetməyib,
Mahi-cəbinində bu beyza nədir?

Zülfi qara, lə'li-ləbi dilrüba,
Dişləri dürr, arizi-həmra nədir?

Nərkisi-məstində bu cəzzablıq,
Guşeyi-çeşmində bu ima nədir?

Mərdüməki-çeşmdə nuri əyan,
Nitqdə bu nitqi-məsiha nədir?

Zahir əgər olmasa hər aləmə,
Aləmi-ə'la nədi, ədna nədir?

Bir belə canana əgər aşiqi,
Canını qurban edə, pərva nədir?

Narına yanmağa Səməndər kimi,
Şəm'inə odlanmağa pərvanədir?

Zahidi-biçarəni heyrət alıb,
Fikri, xəyalı budu, həlva nədir?

Kor gəlib, kar qalıb qanmayıb,
Aləmi-mə'nada bu mə'na nədir?

Cilvəsi gər olmazsa Nəvvabidə,
Tuti kimi təb'i şəkərxa nədir?

* * *

Məstanə gözlərin genə bir müddəası var,
Lə'li-ləbin başımda əcaib həvası var.

Gülzari-hüsni-yar edib cilveyi-cəmal,
Rizvanə bənzəyir, yenə yüz min səfası var.

Mişkinə, xalü xətə dedim uyma, ey könül,
Bu dəşti-qəmi-Xütən çölüdür, çox cəfası var.

Müşk ətrini eşitsə əgər cövr edə yə'qin,
Hər kimsənin ki, sinədə eşqin yarası var.

Etdim, təbib, eşqə əyan sirri-eşqimi,
Verdi cavab, sanma bu dərdin dəvası var.

Eşq atəşinə yanmagilən, eylə sən həzər,
Əzmi-vüsal qıyma ki, çox-çox xətası var.

Nəvvab, əgər təvaf qıla Kə'beyi-vüsal,
Kuhi-Mina eşqinə can tək fədası var.



* * *

Səbur, etdi əş'arın əcəb xüsəndhal oldum,
Cəvahirnəzmdir, vəh-vəh, nə xoş lö'löi-qəltandır.

Əcəb vaqifsən əş'ara, vüqufun Zakirə bənzər,
Fədai müftəxir olsun, özü gər fəxri-ürfandır.

Sənə gər xaliddir Asi, bəradərdir mənə Azər,
Əgər nəəm ül-bədəl sənsən, yəqin bu bəxşi-Yezdandır.

Zamandır, zir zülmətdə qalıb əş'arlar, Zui,
Bihəmdüllah ki, bürci-sə'ddən yenə nümayandır.

Neçə əyyamdı məh müxtəfidi çahi-zülmətdə,
Təşəkkür eylərəm kim, Yusifidən indi tabandır.

Fədayi iltifat etməz, "Fəramuşan"a bir gəlməz,
Gəlib bir dərdi-dil bilməz, bu necə əhdü peymandır?

Dizaq içrə, Səbur, əgərçi sən salari-ürfansan,
Rücu'in hadiyə yoxdur ki, o bir paki-pərrandır.

Sizə bədxah ola aləm, ziyanı bu qədər yetməz,
Neçün Nəvvab peyvəstə sizə qəlbilə xahandır?

* * *

Əya Xan Qaradaği, yetiş fəryadıma, barı,
Mənim halıma seyr eylə ki, aləm əhli heyrandır.

Məni bir şuri-qövğaya salıb bir səngdil dilbər,
Qədi sərvi-sənubərlər, yüzü həm mehri-tabandır.

Xəttü xalı müənbərdir, yüzü gülbərg tək tərdir,
Qamu xubana əfsərdir, bu bir lə'li-dirəxşandır.

Məni şeşdəri-heyrətdə qoyubdur bir büti-rə'na,
Könül Sən'an kimi kuhi-biyaban içrə heyrandır.

Zənəxdanında hindu xalını görgəc bu mürği-dil,
Şikənc zülfə bənd oldu ki, o bir təng zindandır.

Gülə həmbənd olan könlüm olub bülbül kimi bismil,
Onun əhvalına sünbüli-bənəfşə zarü giryandır.

Mənim əhvalıma ağlar gül üstə bülbüli-şeyda,
Tökər gül üstə əşki-qəm, əza bəzmi nümayandır.

Fəğanım ərşə çıxmağını sən badi-səbadan sor,
Mənim halımdan agahdır, bəridi-pakbazandır.

Nəzər et sərvi-şümşadə ki, qu-qu aləmi tutmuş,
Qara boynunda qumrilər əsasi-qəm nümayandır.

Gözünlə görmək istərsən səhər bağa xüram eylə,
Mənim könlüm qanından, gör çiçəklər necə əlvandır.

Qoyub hicranda Nəvvabın, kəsibdir taqətü tabın,
Yığıb başına əhbabın, özü sərməstü xəndandır.

* * *

Fədayican, nədir munca kəşakəş?
Bu mollalar bir-birinə al edər.
Bəxil olur insan əgər bir saət,
Amma bu zahidlər məhü sal edər.

Aralıqda itib hökmi-şəriət,
Xahişlərin eyləyiblər təriqət,
Bid'ət salıb, ad qoyurlar həqiqət,
Bu bid'əti zərbəft edər, şal edər.

Din rövnəqi pozulubdur bulardan,
Müşəxxəsdir, mübindir kəma-kan,
O işlər ki bular tutar bigüman,
Nə aqillər eylər, nə cühhal edər.



Hər həftədə birisi baş qalxızır,
"Ənəlhəq"lər deyib bar-bar bağırır,
Avamları öz qövlünə çağırır,
"Əlif" qəddin şəriətin "dal" edər.

Bular salır aləmlərə qovğanı,
Təşrih edib dağıdırlar dünyanı,
Pəst edirlər şəriəti-Qur'anı,
Bu əf'alı inanma Dəccal edər.

Bir-birinə büxl edər aşikar,
Müsəlmanı bir-birinə qırdırar,
Halva yeyib bədöv atlar tək qızışar,
Dizə çöküb qalü mənqal edər.

Cilvələnib bəzmdə gərdən çəkir,
Müridlərin görən vaxta tellənir,
"Bura buyur" deyib ağa səslənir,
Olmayana dillərini lal edər.

Nəfsi-əmmarəyə olublar əsir,
Halva, dolma, pilovadır dəstgir,
Tox olanda çalar nəfir, səfir,
Ac olanda, cəmdəyin kəssal edər.

Bular salar aləmə qovğa səsi,
Bir-birinə qarışdırıb hər kəsi,
Aralıqda sınar kasıb nəsnəsi,
Od yandırıb aləmi tonqal edər.

Yaxşı işə nə lazım çəkmək pərdə,
Əcəb məratib var bu pak dərdə,
Ə'la mənasiblər olur bu yerdə,
Birin nəbbaş, birisin qəssal edər.

Müridlərin hər biri fəal olur,
Üçü, dördü dörd yüzə dəllal olur,

Biri aşpaz, birisi həmmal olur,
Bir neçəsin dərində zəbbal edər.

Aləmi-rəbbani hanı yanana,
Gedib qurban edək canı canana,
Fəda olaq əhdinə, peymanına,
Bular yə'qin dəf'i-qeylüqal edər.

Nəvvab edər bu qövmdən əlhəzər,
Bu kəslərin kuyinə etməz güzər,
Aləmi-rəbbanını dər-dər gəzər,
Tapsa əgər fəda canü mal edər.

## NƏVVABIN MƏHZUNUN ŞE'RİNƏ YAZDIĞI CAVAB

Maşallah bu şe'rinə, Məhzun,
Ki, xərac-rəvac Çinə dəgər.

Nə gözəl nəzmdir, nə xoş əş'ar,
Çəkilib riştəyə üç dürrü gövhər.

Nə həmaqətdi bu, nə xəbti-dimağ,
Bəlkə bir əqddir giran gövhər.

Sərvi tə'rif edərlər aşiqlər,
Çünki yarın qəddinə çox bənzər.

Bavərin olmasın bu dünyaya
Ki, əbülfəthinədir, vamüş-şərr.

Qəlbini tutsa gər kidurət, qəm,
Eylə ol dəm "Fəramuşan"a güzər.

Gör necə bəzmdir bu bəzmi-nəşat,
Arifü kamilü həmidə siyər.



Cəm'dir cümlə əhli-şövqü məzaq,
Təb'i-gövhərləri üç lö'löi-tər.

Mütrib bəzləguy, xoş əlhan,
Saqi simsaqü məhi-peykər.

Rindü rindanə sözləri rovşən,
Yox bu mənzildə zərrə xofü xətər.

Qönçə xəndandı, gül şüküftələnib,
Bülbülün cəh-cəhi cahana düşər.

Nə rəvadır bu vaxtlar etsin,
Hər günün bir dəmi min ayə dəgər.

Ömrümüz puç edib bətalətlə,
Gah üsuli və gah şeyxilər.

Görmədim mən bu işlərin səmərin,
Bu səfahətdə tanımadım bir əsər.

Hücrənin küncünə qaçıb Nəvvab,
Gözlərin vahibül ətayə tökər.

## NƏVVABIN MƏHZUNUN İKİNCİ ŞE'RİNƏ YAZDIĞI CAVAB

Mirzə Məhzun, vüsul olan əş'arın,
Ləzzət verdi manəndi-şirü şəkkər.

Heç bir zada oxşatmanam bu şe'ri,
Məgər in ki, dürrü yaquta bənzər?

Nəzm çoxdur, vəli rəbti binizam,
Ləzzət verməz oxunsa gər mükərrər.

Şe'ri-Məhzun dilrübadır, dilgüşa,
Yüz yol təkrar edib eyləsən əzbər.

Gül qalıbdır yapraqların altında,
Tikan yığıb xəlq çör-çöp dərərlər.

Hər kəsin ki, başında var şüuru,
Bu əş'ara mərhəbalar edərlər.

Yə'qin qıl "Fəramuşan"ın əhli,
Kutubların bu şe'rlə bəzərlər.

Dilrübalar gülzara seyr edərlər,
Çiçək yığıb gül buxağa düzərlər.

Çox xoş olur olsa sualü cavab,
Xoşdur mütəvvəli nə ki, müxtəsər.

Mühəffəfçün şərh eylədin bu şe'ri,
Bu vəzndə qit'ə olubdur əşhər.

Mə'zur tut Nəvvabı kim, şoğlu var,
Ona görə oldu belə müqəssər.

* * *

Yenə başımda bilməm bunca şurü nə qəvğadır,
Həvayi-ruyi-canandır və ya özgə sövdadır.

Bu nə şuridəlikdir kim, tutubdur aləmi yeksər,
Qamu zərrat aləmdə təcallalar hüveydadır.

Olubdur cilvəgər dildari-əzzəl cümlə məxluqə,
Cahan vadiyyi-eyməndir, bu nə Turu, nə Musadır.

Qamu aləmdə zahirsən, qamu ənvarə bahirsən,
Nə müslimdir, nə məscid, nə kəlisadır, nə tərsadır.



Şüai-mehri-rüxsarın salıb Məcnunu kuhsara,
Ona virdi-zəban sənsən bəhanə əldə Leyladır.

Gecə-gündüz çəkib ahü fəğanı Vamiqi-bidil,
Onun fikri yenə sənsən, vəli zikrində Əzradır.

Çapıbdır kuhkəni-bixud əgərçi dağları leykən,
Dili Şirin deyirsə, mətləbi səndə hüveydadır.

Həzarə naləsi, qumri səsi, bülbüllər əfğanı,
Tutubdur aləmi yeksər əgərçi şuru qovğadır.

Sədası qumriyi-zarın, fəğanı bülbülün daim,
Buların məqsudi sənsən, nə güldür, sərvü tubadır.

Əgər ərşə çıxam sənsən, məgər zəminə gər batam sənsən,
Baxam, ya baxmayam sənsən, rüxün kəşşəmsü, beyzadır.

Nolur gər zahir etsən iltifatın bu pərişanə,
Ona bir cilvə etsə daima hər sirrə danadır.

Günüzlər biqərarəm, əşkbarəm hicri-ruyində,
Gecə əncümşümarəm, bir mənəm, bir də sürəyyadır.

Sənin təşviqi-ruyindir ki, saxlar zar Nəvvabı,
Vəgərnə xaki-qəmdə fanivü naçizü bicadır.

* * *

Etdim yə'qin şərabı ki, ümmülfəsaddır,
Hər kəs təqərrüb etsə ona bədnəhaddır.

Uyma fəribi-nəfsə, əzizim, eşit sözüm,
Bilməm ki, bu nə kibrü qüruru inaddır.

Xummar evində rəhli-iqamət salandır,
Vahəsrəta ki, bunca bə'sül məhaddır.

Can nəqdini nisar eyləmək kuyi-yarda,
Hər şəxs olsa eşqdə zinül ibaddır.

Hər kəs ki, cilveyi-rüxi-dildarı qanmaya,
İnsan degil, vəli o siyəhdil cəmaddır.

Nurindən etsə cilvə əgər turi-Sinaya,
Nəvvabi-zarə həşrdə zadül-mə'addır.

* * *

Vəhid ül-əsrsən, ey mahmənzər,
Yüzün şəmsi-münəvvər, zülfün ənbər.

Qaşın tağı hilali-mahi-novdur,
Nə dəxli kim, deyirlər yayə bənzər.

Ziyayi-nuri-ruyin cilvə etsə,
Cahan vadiyyi-eymǝndir sərasər.

Dəhanın sirrini hər kimsə bilməz,
Sözün şəkkər, ləbin qəndi-mükərrər.

Qəddin tək rovzeyi-rizvan içində,
Nə tubadır, nə sərvü nə sənubər.

Rüxün səthində aləmlər nümayan,
Necə ayinədə xurşidi-ənvər.

Nolur Nəvvabə gər etsən təcəlli,
O nuri-ruyinlə, ey şəmsi-əzhər.

* * *

Keçdi ahü zarilə günüm, oldu qara sənsiz,
Nə lazımdır mənə olsa əgər bu masiva sənsiz.

Yanar eşq atəşinə sineyi-suzan hər ləhzə,
Yetə gər rovzeyi-rizvandan abü həva sənsiz.



Günüzlər biqərarəm, əşkbarəm hicri-ruyində,
Olur niran kimi bəstər mənə leyl-əddüca sənsiz.

Gədalıq rütbəsi xoşdur sənin dərgahi-pakində,
Müt'i olsa əgər, mən neylərəm, şahü gəda sənsiz.

Əgər Cəmşid olam yara və ya İskəndərü Dara,
Degil lazım mənə ayineyi-giytinüma sənsiz.

Cəhənnəm yadi-vəslinlə mənə firdövsi-ə'ladır,
Haram olsun, behiştə gər edəm seyrü səfa sənsiz.

Əlim yetsə əgər ki, Xızrvəş ol abi-heyvanə,
Yə'qin et, içmənəm bir cür'ə mən abi-bəqa sənsiz.

Təvafi-kuyi-pakin olmasa Nəvvabə gər qismət,
Mə'nayi-eşqdə neylər dəxi sə'yü səfa sənsiz.

## NƏVVABIN XAN QARADAĞİNİN XƏSTƏ YATDIĞI ZAMAN ONA YAZDIĞI ŞE'R

Əya xani-valanisabi-cavan,
Neçün yatmısan, dur, gəlibdir bahar.

Gülüstanda bülbül fəğan eyləyir,
Gülə naz edər əndəlibi-fikar.

Çiçəkdən müzəyyən olubdur çəmən,
Edir cümləsi sane'in aşikar.

Çəkib qamətin uca sərvi-çəmən,
Olub cilvəgər hər tərəf ruyi-yar.

Olubdur cahan vadiyi-Tur tək,
Edib nuri-baran ruyi-nigar.

Əyan eyləyir nur ənvarını,
Gülü sünbülü səbzəvü cuybar.

Bu mövsümdə xana nə insafdır
Ki, insan tuta xana qərar.

"Fəramuşxanə" fəramuş olub,
Qoyubsan neçə kəsləri intizar.

Fəraqində Nəvvabınız qəmlənib,
Qalıbdır gözü yolda zarü fikar.

* * *

Nədən ol sərvqədlim bir zaman dəf'i-məlal etməz?
Tələttüf eyləyib biçarələr halın sual etməz?

Məgər ali məratiblər, gədalar halını sormaz?
Şahənşahlar məgər rəhm eyləyib əmri-məhal etməz?

Məgər adət degil, gül yüzlülərdə rəhmdil olmaz,
Tərəhhüm eyləyib öz aşiqilə bir məqal etməz?

Əlimdə yoxdu bir çarə, vüsali-yar üçün neylim?
Nigarın fikri hicrandır, yə'qin əzmi-vüsal etməz?

Yeyibdir rəm könül mürği bu ahu çeşmdən daim,
Qalıb hirman çölündə, seyd üçün qəsdi-qəzal etməz?

Gecə-gündüz çəkər Nəvvab ah-zar hicrində,
Məgər aşiqlər əhvalını məhrular xəyal etməz?



## NƏVVABIN MİRZƏ ƏBDÜL ŞAHİNƏ YAZDIĞI MƏKTUB

Əya Şahini-seydəfkən, neçün nəzmin təmam olmaz?
Sənin kimi tülək tərlan şikar etməkdə xam olmaz.

Üqab olmuş məgər rəhzən, künam içrə qalıb şahin,
Bahar əyyamıdır, Şahin, künam içrə mənam olmaz.

Qəzal təb'iniz dami-xəyalə düşdügün billəm,
Yə'qin şiri-məşağildən rəmandır, heç ram olmaz.

Olub əş'ardan məxzən, açıbdır sünbülü süsən,
"Fəramuşan" olub gülşən, gül əyyamı müdam olmaz.

Məgər təht üş-şüa almış mübarək ayın ruyin,
Və ya miğ altına girmiş bu müddətdə qümam olmaz.

Bu yer asardır şairlərə kim, əzm edib Nəvvab,
Əgər tə'viqi-məqsəd olsa, əncami-məram olmaz.

* * *

Ey diriğa, mürği-dil vəqti-bahar,
Oldu bülbül kimi məhbusi-qəfəs.

Qəm çölündə qalmışam, ey piri-rah,
Küçəgərdan oldum, ey mirəsəs.

Dəmbədəm fəryad qıllam hicrdə,
Yox mənə munis bu qəmdə heç kəs.

Zahidin və'zi nə lazımdır mənə,
Abidin qövli və ya bangi-cərəs.

Şəm rüxsarına yandı cismü can,
Qalmadı baqi məgər quru nəfəs?

Qalmışam Nəvvab tək zarü qəmin,
Sən yetiş fəryadə, ey fəryadrəs.

## NƏVVABIN KƏMİNƏYƏ YAZDIĞI ŞE'R

Kəminə, nəzmü əş'arın yetişdi şadman oldum,
Cəvahiri-nəzmdir, vəh-vəh və ya dürdür səmin olmuş.

Gözəl əş'ardır məzınunları həm şe'rdən nazik,
Bəyanı çox mübəyyəndir məzamini mətin olmuş.

Nə xoş mənzumədir gökçək, qamu mə'nası müstəhsən,
Nəbatü qəndü şahdilə məgər yeksər əcin olmuş?

Əcəb lö'löi-qəltandır çəkilmiş riştə nəzmə,
Şəkər ləbdən büruz etmiş ki, böylə şəkkərin olmuş.

Yə'qin bil əvci-ə'laya dayandı nəcmi-iqbalın,
Belə daim kitab içrə ki, əqvalın qərin olmuş.

Riza Nəvvabdır, səndən həm ovqat, ey xahər,
Xəyalı gər pərişandır, sizə leykən mü'in olmuş.

## NƏVVABIN XAN QARADAĞİYƏ YAZDIĞI MƏKTUB

İlla, ey Xan Qaradaği, nə hacət,
"Fəramuşxanə"ni etmək fəramuş.

Məgər ki, tazə dilbərlər tapıbsan?
Olubsan onlar ilə sən həmağuş?

Usandın yoxsa sən əhdi-vəfadan?
Əhibba qaldı heyran zarü mədhuş?

Bu növ'i əhdü misaqını, xana,
Gərək işhar etmək misli-çavuş.

Olub ünqa məgər ki, təb'i-sərşar?
Və ya bihuşdaru eyləmiş nuş?



Bittəqa düşmənə lazımdır etmək,
Mənim bu ərzimi gər eyləsən guş.

Bittəqa zəhr ola, xana, yə'qin bil,
Güvaradır mənə mən eylərəm nuş.

Sizə Nəvvab qılmaz bivəfalıq,
Zibəs hübbün olmayıb qəlbində mənquş.

* * *

Olmadım dərdü qəm hicrdə bir ləhzə xilas,
Oxudum sidqilə min həmdü həzaran ixlas.

Nə olur lütf qıla ol məhi-gərdunvəfa,
Eyləyə xəlqi-cahan içrə məni xas ül-xas.

Sən kimi gövhəri-paki bu cahan içrə yə'qin,
Hüsn dəryasını gər axtarma, tapmaz qəvvas.

Suzi-hicranını gər görməsə bu aşiqi-zar,
Zərbi-ğəş olmur görməyə gər qalü xilas.

Dəxi Nəvvab edə bilməz qəm hicranına tab,
Dudi-ahı necə gör çərxdə eylər rəqqas.

* * *

Vüsali-ruyin olubdur mənə cənanü riyaz,
Təmami-əhli-cahandan sən olmusan mürtaz.

Nə xoşdu cismlə can bir-birindən ayrılmaq,
Vəli mahaldı kuyindən eyləmək e'raz.

Çıxarmazam dilü candan ümidi-vəsli-rüxün,
Olurmu münfəsil, əya, cəvahürü e'raz.

İki cahandan ibarət sənin vüsalındır,
Yə'qin eylə ki, yox səndən özgə bir əğraz.

Sənin şəfaətinə gözlərin dikib Nəvvab,
Rəvadımı edəsən həşrdə ona e'raz.

* * *

Atəşi-hicrə yaxıbdır məni bu köhnə rübat,
Nə rəbi'ü nə xərifü nə şətavü nə şübat.

Bilmənəm eyd nədir, eyş nədir, tiş nədir,
Qalmışam əlləri bağlı necə bir tifli-qumat.

Aşiyan etsəydim Kə'beyi-kuyində onun,
Dərgəhi-pakini şut eylərdim çün Vətvat.

Dağlayıb lalə kimi sinəmi, səbrim tükənib,
Bağlayıb qübbeyi-qəm hər tərəfə çün batabat.

Şeşdəri-heyrətə nərradi salıb Nəvvabı,
Ceyşi-hicranı edib qəl'eyi-səbrimi məhat.

* * *

İlla, ey gülzari-gülşəni-bəhcət, xudahafiz,
Səri-kuyində bir dəm olmadım rahət, xudahafiz.

Talandı, şükür hicranə səbrim xanəsi yeksər,
Nəyim qaldı dəxi ğeyr əz cəmü zillət, xudahafiz.

Sənin eşqin məni Məcnunsifət saldı biyabanə,
Nə Leyli kimi vəslin olmadı qismət, xudahafiz.

Nəvai-şuri-vaveylanı məndən yad edib Sən'an,
O da çox çəkdi zəhmət, görmədi vəslət, xudahafiz.

Qəmi-eşqində bülbüllər kimi əfğan edir Nəvvab,
Güli-ruyin həvasilə çəkər möhnət, xudahafiz.



* * *

Ey külbəyi-əhzanıma ol ruyi-ənvardan şüa',
Yetirə könlüm xanəsinə mehri-ənvardan şüa'.

Kə'beyi-kuyini əvvəl şut edən zayir mənəm,
Rəhnəmunim olsa gər xurşidi-əzhərdən şüa'.

Mübtələnvar edər ol sabitü səyyarədən,
Gər təcəlla etsə, ol şəmsi-münəvvərdən şüa'.

Məhcəbinin şö'ləsi aləmləri rovşən qılıb,
Cilvəgər gər olsa, ziri-zülfü-ənbərdən şüa'.

Bülbülün nitqi kəsilməz, görsə əfğanlar edər,
Gül kimi ol arizi-gülnarü əhmərdan şüa'.

Qəlbi-Nəvvabə nolur etsən əta gər zərrə,
Turi-Sinada olan ənvari-əşhərdən şüa'.

* * *

İllər ilən aləmi etdim sorağ,
Eşitmədim sən kimi rovşənçırağ.

Nə qəddin tək ər'ərü şümşadü sərv,
Nə xəttü xalın kimi gülzarü bağ.

Yox nəvası bülbüli-biçarənin,
Çulğayıb ətrafı fəğani-kəlağ.

Qəmdən olub bənəfşə zarü nigun,
Şəqaiqin bağrı olub dağ-dağ.

Vəfası yox bu dünyanın, ey əziz,
Eyləgilən qəlbini qəmdən fərağ.

Sərv kimi hanı xüram edənlər,
Xakə dönüb lə'li-ləbü gül yanağ.

Məhvəşlər xakilə yeksan olub,
Xakları olubdu həm xişti-bağ.

Nəvvabdan nəsihəti guş qıl,
"Va ma əla ər-rəsul illa əl-bəlağ".

* * *

Tapdı çün badi-səbadan tabi-ənbər bari-zülf,
Aşiyani-mürği-ruhim etdi tarü mari-zülf.

Oldu gülzari-behişt ədnində çün bağiban,
Tapdı yarın gülüzarında çü istiqrari-zülf.

Rövzeyi-rizvan içində həlqələndi hər tərəf,
Ademü Həvvanı icva eyləyən şəhmar zülf.

Şəbnəmi-rüxsaridən sirab olur hər ləhzədə,
Tellənir hər dəmdə çün gülzarda əzhər zülf.

İqtiran etdi çü bürci-sə'd içində şəmslən,
Ta əbəd düşməz vəbalə bəxt dər-dər tari-zülf.

Ənfəsü afaq ol dəmdə edərlər inqilab
Kim, müşəvvəşliq üzünə eyləyə əş'ar zülf.

Hər kəsi gördü, müqəyyəd eylədi tərsasifət,
Şeyx Sən'an kimi saldı boynuna zünnar zülf.

Saldı qeydi-daminə Nəvvabı insaf etməyib,
Sirri-eşqin eylədi aləmlərə işhar zülf.



## BURSA ŞƏHƏR SAKİNİ SƏDRƏDDİN ƏFƏNDİ LƏMBƏRANİNİN XAHİŞİLƏ OSMAN PAŞANIN QIZI NİGAR XANIMIN ŞE'RİNƏ NƏZİRƏ

Fəryad edərəm dəhrdə imdad edəcək yox,
Əfğan çəkərəm halımı bir yad edəcək yox.

Əfsus ki, çərxin səmtindən dili-zarım,
Bərbad edəcək çox, vəli abad edəcək yox.

Qeydi-qəmə məhbus olub mürği-rəvanım,
Bir rəhm qılıb qeyddən azad edəcək yox.

Qəm ləşkəri səbrim evini eylədi viran,
Bu qədr qəmü möhnətə mö'tad edəcək yox.

Dini-məsnədinə sədr deyirlər məni, lеykən,
Bu taleyi-varunumu bir yad edəcək yox.

Qəm çəkmə, bulursan şərəfi-vəsləti, ey dil,
Qət etmə, ümidin demə dilşad edəcək yox.

Hər ləhzə məni şad edir şövqi-vüsalın,
Nəvvab kimi qəmdə məni şad edəcək yox.

* * *

Mənəm bir şuxü şirinkar dilbər,
Edib dərdim firavan, taqətim taq.

Nə uyqum var şəbi-hicrində bir dəm,
Nə bayqu kimi göz-göz üstə qoymaq.

Mənim eşqim onun hüsnü camalı,
Olub Sən'an kimi məşhuri-afaq.

Ümid etməm, bu cür'ət etmənəm həm,
Olam həmxabəvü həm saqbisaq.

Vəleykən gəlsə gər vəsli xəyalə,
Qənimətdir o dəm bir ləhzə uymaq.

Keçibdir xoş günü Nəvvabi-zarin,
Nə lazım yarla durmaq, oturmaq.

* * *

Rəqiblər mənə gər etsə zülmü qəsdi-həlak,
Sənin ki lütfün ola, etmənəm olardan bak.

Yüzündü qibləgahım, xaki-dərgahın Kə'bəm,
Dilimdə virdi-zəbanımdı nə'bdü iyyak.

Olubdu nəqşi-rüxün qəlbim içrə çün mir'at,
Könüldə yoxdu dəxi qeyrin səvak-səvak.

Gecə-gündüz çəkərəm eylə nalə hicrində,
Təzəlzül eyləyə ta mahü mehrü nöh əflak.

Səba yetirməyə Nəvvabə buyi-rüxsarın,
Həzar canı ola, vardı cümlə bimi-həlak.

* * *

Nə vaxta kimi, ey dil pürməlal,
Edərsən bu dünyadan ötrü xəyal.

Bəsi heyif, ömrün ki oldu təbah,
Yetişdi əcəl, oldu zaqül-məcal.

Məgər bilmədin bu cahani-xərab,
Edir ömrünü qət ba mahü sal.

Nərə getdi şahan zilehtişam?
Hara getdi peyğəmbəri-zülcəlal?

Hanı Rüstəmü Givü Güdərzü Sam,
Fəramərzü Bürzuyi Söhrabü Zal.



Qamu qəbr içində olub tarü mar,
Nə şadlıq bilirlər, nə sevgivü məlal.

Bu dünyadan ötrü nədir qəm yemək
Ki, əvvəl fəna, axirində zəval.

Bəsirət gözün açginən, et nəzər,
Edib cilvə nuri-rüxi-bimisal.

Qamu masəva vadiyi-Tur tək,
Dirəxşan olubdur rüxi-zülcəlal.

Həqiqətlə Nəvvab tək nazir ol,
Bəsirət gözilə nə xabü xəyal.

Ki, cümlə cahandan olub aşikar,
Nə bir dəm, nə bir ləhzə fi külli hal.

## NƏVVABIN XAN QARADAĞİYƏ CAVABI

Ey baisi-icadi-həmə aləmü Adəm,
Vey bargehi-qürubi-xudavəndə məqdəm,
Sərdəftəri-əşrəfi-cahan şə'ndə xatəm,
Zülmətgədeyi-dəhrə olan nəyyiri-ə'zəm,
Sultani-mübin, Xosrovi-din, şahi-du aləm.

Ey ismi-şərifin "və ləqəd əlləməl əsma",
Ənvari-rüxün şəşəyi-saheti-ğəbra,
Lö'lak sənin şə'ninə Yasinlə Taha,
Kafidi dəxi rəcəsdən ol qadiri-yekta,
Etmiş səni, övladını həm paki-mükərrəm.

Nə nisbəti var ruyinə "Vəşəmsü Zühanın",
Ya muyinə təşbihi ola leylü canın,
Taci-səridir, xayi-dərin, şahi-şəhanın,
Hübbündədi asayişi əlbəttə du səranın,
Rizvandı vüsalın, vəli hicrindi cəhənnəm.

Ol dəm ki olur aləmara şur nümayan,
Nə yada düşər əhdü, nə misaqü, nə peyman,
Möhtac olur lütfünə şahənşahi-dövran,
Ümmidi-nicatə düşər ol vaxtda şeytan,
Lütfilə şəfaət eləmin gər aça pərçəm.

Gər nuri-rüxün həşr günü etsə təcəlla,
Zərrati-cahan xiyrələnib mat olu yekca,
Nə Musai-İmran qalır, nə də Məsiha,
Təzyin tapar rovzeyi-firdövsdə tuba,
Nəvvabını ol ərsədə tapsa aləm.

* * *

Əzəl günü, ey məh, sənə dildar mən oldum,
Axirdə yenə həsrəti-didar mən oldum.

Gül qönçəsi tək bağrımı qan eylədi qəmzən,
Bülbül kimi əfğanə giriftar mən oldum.

Hicr atəşinə canı yanan çoxdu cahanda,
Amma qamusundan da günü tar mən oldum.

Saldın nəzərindən məni, ey Leyliyi-dövran,
Məcnun kimi vəhşilər ilə yar mən oldum.

Fərhadsifət tişeyi-qəm saldı ayaqdan,
Şirin ləbin həsrəti xunbar mən oldum.

Sən mülki-bədən içrə yə'qin qütbsən, ey mah,
Başına dolanmaqlığa pərgar mən oldum.

Əğyar olub Kə'beyi-kuyində müəzzəm, mükərrəm,
Hicrində, vəli xarü diləfkar mən oldum.

Nəvvabı çəkib dari-qəmə bir büti-rə'na,
Mənsur kimi dəhrdə əşhar mən oldum.



* * *

Fəraqi-yarda karım olub fəğan, ölürəm,
Solubdu gül kimi pəjmürdə cismü can, ölürəm.

Bəlavü möhnətə salmış bu rüzgar məni,
Gecə-gündüz çəkərəm ahü əlaman, ölürəm.

Kimə deyim qəmimi, bəs nə eyləyim çarə,
Fəraqın atəşinə yandı xəstə can, ölürəm.

O tari-zülfünə vəhşi könül düçar olalı,
Nə təndə tab qalıbdır, nə canda can, ölürəm.

Fəğanım ərşə çıxıb bülbüli-bahar kimi,
Bahar ömrümü hicrin edib xəzan, ölürəm.

Yetişsə bir də əlim daməni-vüsalə əgər,
Dəxi mən istəmənəm hurü həm cinan, ölürəm.

O gülzar ki, eylər cəfalar aşiqinə,
Vəfası çoxdu rəqibə, vəli nihan ölürəm.

Fəda o qamətinə, mahü mehr təl'ətinə,
Nihali-sərvini gəl eylə sayəban, ölürəm.

Tələttüf eylə bu Nəvvabə, ey mələkmənzər,
Tərəhhüm eylə ki, halım olub yaman, ölürəm.

* * *

Fəraqi-yar edib qəlbimi fikar, ölürəm,
Urubdu hicri-rüxü cismi-canə nar, ölürəm.

Vüsalə talibdim əldə nəqdi-canimlən,
Fəraqı canım alıb, etdi xarü zar, ölürəm.

Hezar hiylə ilə dam vəsl üçün qurdum,
Xütən qəzali kimi eylədi fərar, ölürəm.

Bu növ dərdi-qəmə, ey xuda, nə çarə edim,
Kəsibdi sayəni sərdən o gül'üzar, ölürəm.

Səvad türrələri eyləyib günümü siyah,
Şərarə cana salıb atəşin üzar, ölürəm.

Düşəndə yadıma şirin ləbin şəkkərdəhəni,
O mahi-mehr camalında zülfi-tar, ölürəm.

Xəzan olanda tökər barü bərgini əşcar,
Mənim xəzanıma bax kim, olub bahar, ölürəm.

Edibdi Qeys kimi dəhr içində Nəvvabı,
Olubdu məskən ona dəştü kuhsar, ölürəm.

## NƏVVABIN XAN QARADAĞİYƏ YAZDIĞI QƏZƏL

Rüzgarın rəvişi kəc olacaymış, nə bilim,
Sayəyi-yarı başımdan alacaymış, nə bilim.

Firqəti-yari-vəfadarda rəngim saralıb,
Hicri-ruyində qədim xəm olacaymış, nə bilim.

Şəşdəri-heyrətə salmış, məni nərradi-fələk,
Sinədə möhreyi-dil mat olacaymış, nə bilim.

Hər zaman söyləyirəm həsrətlə və əsəfa,
Gözlərim Yusifə həsrət qalacaymış, nə bilim.

Ney kimi nalə edib gözlərim qan-yaş axıdıb,
Sinəmi lalə təki dağlayacaymış, nə bilim.

Xani-valayi-Qaradaği məni hicrə düçar
Eyləyib, sinəmə min dağ uracaymış, nə bilim.



Yad olma, əzizim, yadına sal yarları,
Yar yar olmazkən yad olacaymış, nə bilim.

Gənci-şayanını əldən çıxarıb həsrətlə,
Künci-pünhanda Nəvvab olacaymış, nə bilim.

## MÜRƏBBE'

Bir nigari-novbaharın gülcamalın istərəm,
Lö'löyi-tər tək camalı üzrə xalın istərəm,
Cuybari-hüsn ara, şəkkər zülalın istərəm,
Mey içib məstan gəzən çeşmi-ğəzalin istərəm.

Aşiqin tərk eyləyib, amma özü məstan gəzər,
Naz edər hər dəm rəqibə bağ ara şadan gəzər,
Yadına bilmərrə düşməz, əhdilə peyman gəzər,
Bir belə insafsız yarın vüsalın istərəm.

Yarını həsrət qoyub aləm ara xar eyləyən,
Sındırıb iqrarını firqətdə bimar eyləyən,
Şad edən əğyarını hər ləhzə təkrar eyləyən,
Gərdəni-mina, qəddi-Tuba misalın istərəm.

Rövzeyi-hüsn içrə guya ahuyi-tatardır,
Xali-mişkini zənəxdanında ənbərbardır,
Ləbləri gül, dişləri həm lö'löyi-şəhvardır,
Bir belə rə'na qəzalin, xəttü xalın istərəm.

Bülbüli-şuridə tək cəh-cəh uran, dad eyləyən,
Məst olan, tavus tək məstan geyib, məstan gəzən,
Aşiqini görcəgin tərlan kimi gərdən çəkən,
Naz edən nazikbədən tuti məqalın istərəm.

Bağı-gülzar içrə ahu kimi hər yanə baxan,
E'tinalar eyləyib əğyarə naz ilə axan,

Aşiqi-zarın dilini nari-hicranə yaxan,
Dərgahi-pakində əğyarın zəvalın istərəm.

Əl çəkib Nəvvabdan, yarəb, o yari-bivəfa,
Nazilən eylər ona hər ləhzə min cövrü cəfa,
Bir deməz biçarə məndən görmədi zövqü səfa,
Rəm yeyən, ram olmayan vəhşi ğəzalin istərəm.

* * *

Zindani-qəmdə oldu günüm qarət, ağlaram,
Sövdayi-eşqin ilə çəkib zillət, ağlaram.

Zülfün havası ilə olub tirətər günüm,
Qalü bəlada hicrin olub qismət, ağlaram.

Ahimlə dövri-şəmsü qəmər halə bağlayıb,
Bir dəm sənlə eyləmədim söhbət, ağlaram.

Bülbül kimi novayə gəlib eylərəm fəğan,
Hicri-rüxündə oldu kəmanqamət, ağlaram.

Ahü fəğanım ərşə çıxıb, dilbəra, nə edim?
Sənsiz məni əhatə edib möhnət, ağlaram.

Kuyində sərfəraz olubdur rəqiblər,
Edirlər hər zaman mənə min töhmət, ağlaram.

Əncümşümar olubdu fəraqində gözlərim,
Yadi-vüsalın ilə çəkib həsrət, ağlaram.

Nəvvab tək alıbdı əlimdən təvanımı,
Bitaqət eyləyibdi məni firqət, ağlaram.

* * *

Düşəndə gül'üzarına nigarın gül kimi şəbnəm,
Qəfəs tək cismi-zarimdən çıxar mürği-rəvan hər dəm.



Düşəndə yadıma xalü xəti ol türfeyi-məhbubun,
Büti-Azər kimi cismim olur bisurətü bidəm.

Əcəb ayindir, aşiqlər içrə bu nə adətdir,
Verərlər zülfi-şəhmarə mü'ənbər türreyi-pürxəm.

Kəsibdir taqətü tabü təvanım ol kəmani-əbru,
Nəzakətlə urar müjgan oxun bu sinəmdən dəm.

Düzülmüş səfheyi-rüxsari-mahinə ərəqi-nəqdi,
Səbadan kuyuya düşmüş, gül üstə lö'löyi-şəbnəm.

Gecə-gündüz fəraqində sənin, ey şuxi-bipərva,
Səməndər tək yanar qəm atəşinə sineyi-pürğəm.

Qəmində biqərarəm, əşkbarəm, sövgvarəm həm,
Qəmi-hicrindən özgə yox mənə bir munisü həmdəm.

Olur xəffaş tək pünhan qamu məhbublar daim,
Ziyai-hüsnü dildarın açə gər gün kimi pərçəm.

Kəramət eyləyib, yarəb, nolurdu ol şəhi-xuban,
Dili-zarinə Nəvvabın edəydi lütflə mərhəm.

## SEYİD ƏZİM ŞİRVANİYƏ

Ey müzəxrəf danışan şairi-dövran Əzim,
Seyyidü sərdərü sərdarü süxəndan, Əzim,
Dəhri-gülzarı ara, bülbüli-xoşxan, Əzim,
Əzizim, iki gözüm, cəddinə qurban, Əzim.

Şə'nin üzmadı əgər, biz deyilik əzmi-rəmim,
Abi-heyvan təkisən, biz dəxi üşşaqi-həmim,
Seyyidin təb'i kəramətli olur, nəfsi səlim,
Nə rəvadır deyəsən hərzəvü hədyan, Əzim.

Sən əgər ali-Əlisən, hanı qeyrət de görüm?
Haşimisən, qüreyşisən, hanı qeyrət de görüm?
Allah, Allah, nədi bir belə qisavət de görüm?
Sakit ol, samit otur, sən demə peyman, Əzim.

Cəddini mədh edən vaxta, aya alicənab,
Niyə qarnına düşər sancı, edərsən təbü tab,
Sən də mən kimi gözünün yaşını tök, başını çap,
Cəddini yaxşı tanı, mərtəbəsin qan, Əzim.

Aç bəsirət gözünü şahi-şəhidanə tərəf,
Baxgilən Kərbübəla səmtinə, meydanə tərəf,
Məhliqa canları gör, tiği-cəfa eylə tələf,
Gör ki, sən də ölüsən qanına qəltan, Əzim.

Şur başında əgər olsa bilərsən ki, nə var,
Eşqi-gülzarinə gəl, seyr eylə bir keçdi bahar,
Qumriyü bülbülü çüğdi necə gör zarü fikar,
Eşq sultanına olmuşla əzaxan, Əzim.

Gər yazam həcv sənə cümlə müsəlmanə dəyər,
Zəmm daşın gor atam, şişeyi-imanə dəyər,
Bədənə hadis olan sədəmə yə'qin canə dəyər,
Nə edim, çarə nədir, cuş qılır qan, Əzim.

Hüsni-xülqi bizə mə'lumdu Mirzə Həsənin,
Yox lüzumi o cənabə dəxi iqrar sənin,
Mənbəyi-feyzdir aləmlərə kani-kürəsin,
Mə'dəni-elmü ədəb, məlcə'i-ürfan, Əzim.

Kim deyir rus dili bid'ətdir, aləmara,
Cahil əlsinələr xiclətdir, aləmara,
Hər dilin mə'rifəti izzətdir, aləmara,
Mə'rifət elmini kim eyləyir kətman, Əzim.

Dəxi bihudə danışma sən, əya, paki-nihad,
Eylə Nəvvab kimi nəfsi-zəlumilə cihad,
Qəmlə qan-yaş axıt, eyləgilən cəddini yad,
Nariza olmaya, ta şahi-şəhidan, Əzim.



## TƏCNİS

Eylə ruyindən o zülfi-siyahi yanə bu gün,
Salgilən şə'şəyi-hüsnünü hər yanə bu gün,
Açgilən bircə o məh təl'əti məstanə bu gün,
Ta ziya bəxş ola şəm'i-şəbistanə bu gün.
Şəm'i-ruyinə mənəm sevgili pərvanə bu gün,
Aşiqi-suxtəyəm yanmağa pərvanə bu gün.
O büllurun ələ aldın genə peymanə bu gün,
Düşəcək rəxnə yə'qin əhdilə peymanə bu gün.
Döndərib gözlərini mey genə al-qanə bu gün,
Salacaq aşiqi-biçarəni əl-qanə bu gün.
Gözlərim yaşı dönübdür genə ümmanə bu gün,
Nə düşər yadıma şabid, nə də peymanə bu gün.
Ahü naləm yetişir xərgəhi-Keyvanə bu gün,
Yox əsər yarıma kim, bir çıxa eyvanə bu gün.
Zülfi-mişkinə məgər yar çəkib şanə bu gün?
Ki, düşüb etir iyi kuhə və biyabanə bu gün.
Eylə Nəvvabını bir yad, çıxart yanə bu gün,
Od tuta ta ki, rəqibin dili bir yanə bu gün.

## NƏVVABIN "MƏCLİSİ-FƏRAMUŞAN"A YAZDIĞI ŞE'R

Aşiq oldum nagahan bir şuxi-bipərvayə mən,
Saldım axir öz-özümü bir əcəb qovğayə mən.

Şövq vəsli eylədi Vamiq kimi şeyda məni,
Həsrət oldum, ey diriğa, yetmədim əzrayə mən.

Tovf qıldım Kə'beyi-kuyini zayirlər kimi,
Yetmədim, səd heyf, bir dəm Zəmzəmi-Minayə mən.

Bir qədi-Tubadan ötrü keçməyim rizvandan,
Dikməyim heyrət gözümü bir gözləri şəhlayə mən.

Ol zamandan kim, gözüm düşmüş o Leyla təl'ətə,
Qeys tək ağlım çaşıbdı, düşmüşəm səhrayə mən.

Aldı şirin canımı ol Xosrovi-xuban, nə edim?
Kuhkən tək salmayım səs dağü səhrayə mən.

Etmənəm hicr atəşinə səbr, daim söylərəm,
Gəlməyəydim, ey xudaya, bu fəna dünyayə mən.

Olmazam Sən'an kimi məşhuri-bəzmi-xasü amm,
Etmənəm meylü həves bir bivəfa tərsayə mən.

Çün məcazi eşqdən çəkdim əlim Nəvvab tək,
Bağladım sidqi-dilile Qadiri-yektayə mən.

## DOSTLARIMDAN BİRİNİN XAHİŞİ İLƏ BU ŞE'Rİ YAZDIM

Saat, səni qəsəm verrəm xudaya,
Hali-zarım yarəsin et nümayan.
Söylə, səndən ayrı düşəndən bəri,
Dərdü qəmim həddən olub biyaban.

Yar qoynuna girəndə acizanə,
Ərz etgilən dərdimi yanə-yanə,
Ayırdı çün məni səndən zəmanə,
Pərvanə tək yanar sənsiz cismü can.

Çıxartma sən yaddan bu binəvanı,
Fəraqində ərşə çıxan fəğanı,
Yetir, Saat, yara salam-duanı,
Nə bir dua bəlkə həddən bipayan.

Hali-zarım sənsiz olubdur xarab,
Saat kimi qəlbim edər iztirab,



Nə təndə aramım, nə didəmdə xab,
Müntəzirəm vüsalına hər zaman.

Əğyarlar nişini sən sanma nuş,
Rəqiblər sözlərini etmə guş,
Nəvvabını etməgilən fəramuş,
Odur sənə öz canından mehriban.

## XAN QARADAĞİYƏ

Otuz dəfə dad etmişəm sənə mən,
Zahidlərə uymagilən, ağa, sən.

Gecə-gündüz bunlar ilə düşmüşəm,
Görmüşəm heç birində vəfa mən.

Xidmətində oturasan yüz illər,
Görəcəksən, aya, dərdə dəva sən.

Dəva bilsə keçəl başına eylər,
Cənabına bilmə zəhmət rəva sən.

Yüz il sənə və'də versə inanma,
Bittəqadır, saf bilgilən hava sən.

Nəvvabdan qəbul qıl nəsihət,
Ta görəsən dərdlərinə şəfa sən.

## XAN QARADAĞİYƏ TƏSƏLLİ

Sənin hasidlərin, xana, həmişə xari-zar olsun,
Sənə əğyar olan kəslər cahanda şərmsar olsun.

Səni mənzurdan ayrı salanlar səmigun olsun,
Səni məhbubdan təfriq edənlər tarü mar olsun.

Qəm etmə, qıl təvəkkül dərgəhi-paki-xudavəndə
Ki, ta rənc-ələmdən şüğli-düşmən ahü zar olsun.

Təvəkkül cövşənin gey əyninə, xana, Təhəmtən tək
Ziyan yetməz, əgər hasidlərin İsfəndiyar olsun.

Sənə hamı çü Yəzdandır, onun lütfü firavandır,
Nə lazım qüssə etmək, düşmənin gər səd həzar olsun.

Sizə təstir olan təqdirdən, xana, nə mümkündür,
Cahan düşmən ola, bir zərrə kəsrü inkisar olsun.

Məramı müddəinin şeşdəri-heyrətdə mat olsun,
Vətən bədxahü əşrarın vücudinə məzar olsun.

Sizə təqrib olan dünya hüdusindən əmin olsun,
Cahanda daima şə'nü cəlalı bərqərar olsun.

Qulami-kəmtərin olsun dərində cümlə hasidlər,
Cəlil olsun cəlalın, şövkətin baiqtidar olsun.

Xəzanın sərsəri, gül'üzar ömründən bərri olsun,
Gülüstani-vücudun daima fəsli-bahar olsun.

Sənə Nəvvab daidir, ə'yandır, intişar olmuş,
Sənin lütfündə lazımdır cahanda iştihar olsun.

* * *

Əğyarlar ayırdı məni kuyi-yardan,
Oldum kənar, heyf, o gülgün üzardan.

Yansın fəraq atəşinə mən kimi görüm,
Hər kəs məni ayırdı o çeşmi-xumardan.

Əfğanü zar eyləməsin, nə etsin əndəlib,
Ol dəm ki, ayrı düşdü gül novbahardan.



Könlüm quşu müqəyyəd olub dami-zülfünə,
Olmuş əsiri-zülf, nə qəm şahmardan.

Giysuyi-ənbərinə çatmaz əlim, nə edim?
Yetməz məşami-canə o müşki-tatardan.

Əncümşümar olubdu fəraqində gözlərim,
Al canımı, xilas eylə bu intizardan.

Sənsiz nə tabü taqətü aramü nə şəkib,
Vallahi, keçdi səbrü qərarım qərardan.

Əfsusü ah, yetmədim ol sərvi-qamətə,
Gün keçdi iztirabü gecəm iztirardan.

Etməm ümid vəsli-rüxi-yarə həşr ara,
Ta bir xətt almasam ələ həştü çəhardan.

Gər müjdeyi-vüsali-cəzadə yetişməzsə,
Heyhat əgər ki, baş götürəm mən məzardan.

Nəvvabi-zar atəşi-hicranə qərq olub,
Pərvanəyə nədir dəxi pərva şərardan.

* * *

Ömrüm qurtardı dərdü qəmü ahü zarilən,
Səbrim tükəndi hicri-rüxi-mahi-yarilən.

Gülzari-hüsnə heyf ki, bir etmədim nigah,
Bir ləhzə söhbət eyləmədim gülüzarilən.

Ahu nigahı ilə edib könlümü şikar,
Yarəb, nə eyləyim belə şahin şikarilən.

Şami-fəraqinlə keçər günlərim qara,
Sövdayi-zülfünilə, gecəm şahmarilən.

Bülbül kimi o gül yüzünə həsrət olmuşam,
Allah rizası, qoyma öləm intizarilən.

Yüz min xəyalü ləşkəri-hicrani-bigəran,
Biçarə bir nəfər neyləsin səd həzarilən.

Sayə kimi ayağına baş qoymuşam bu gün,
Olma riza, qalam belə mən inkisarilən.

Nəvvabi-zar ahü fəğanilə ruzü şəb,
Gözlər yolun bu dideyi-əncümşümarilən.

## MƏŞƏDİ CƏFƏRQULUNUN ÖLÜMÜ MÜNASİBƏTİLƏ NƏVVABIN YAZDIĞI ŞE'R

Ey diriğa, münhəzim oldu sərayi-cismü can,
Rəm yedi mürği-rəvan qaldı xərabə aşiyan.

Çün qəfəsdən bülbüli-şuridə pərvaz eylədi,
Qalmadı ovd etməginə dəxi bir zərrə güman.

Aşinalər birbəbir kəsdi nəzər Nəvvabidən,
Səmti-üqbayə qamu əzm etdilər pirü cavan.

Rəxti-pərqudan çıxıb xak içrə tutdular qərar,
Qəsri-ə'ladan köçüb qəbr içrə etdilər məkan.

Kəştiyi-mövtə minib bəhri-fənayə düşdülər,
Çəkdilər məllahlar heyrət çölünə badi-ban.

Heç birindən qalmadı bircə nişanə yadigar,
Gərçi qaldı hər birindən bir quru boş dastan.

Bar Aliha, cümləsini əfv qıl ruzi-cəza,
Onlara mənzil əta eylə behişti-cavidan.



Bu dəni dünyaya bavər eyləmə, bel bağlama,
Uyma xabi-qəflətə, yol üstə getdi karivan.

Ənbiyavü övliyavü ovsiyalar getdilər,
Padşahlar cümləsi xak içrə oldular nihan.

Nəsrəddin şah kimi şaha bu dünya qalmadı,
İçdi çün cami-şəhadət, oldu üqbayə rəvan.

Babiyi-bidin o şahənşahı çün etdi şəhid,
Mürği-ruhi rövzeyi-rizvanda etdi aşiyan.

Qatili-məl'unə lə'nət qaldı ta ruzi-cəza,
Künci-niranda çü tutdu Şümr dünilə məkan.

Cürmini şahi-şəhidin bəxş qıl ruzi-cəza,
Əfv qıl Nəvvabı həm sənsən xudayi-mehriban.

* * *

Canan yolunda kimdi mənim kimi xar olan,
Daim bulud kimi tutulub əşkbar olan.

Gülzari-hüsni-pakinə həsrət qalan bu gün,
Bülbül kimi nəvai-fəğanə düçar olan.

Şəm'i-camalına yana pərvanələr təki,
Xaki-qədəmi-pakinə gərdü ğübar olan.

Suzi-fəraqilə sızıldar yaralarım,
Mən kimi kimdi səbr edib əncümşümar olan.

Nərgis kimi dikən gözünü yollara müdam,
Boynun əyən bənəfşə kimi, sövgivar olan.

Leyla xəyali ilə keçən günləri qara,
Vəhşilər ilə yar tutan, kuhsar olan.

Nəvvab kimi kimdi bəlaya düçar olub,
Mənsur var şövqlə, mənzuri dar olan.

## SEYİD ƏZİM ŞİRVANİYƏ

Səmayi-əvci-rif'ətdə nə xoş mehri-vəfasanmış,
Şəbistani-məlahət içrə şəm'i-pürziyasanmış.

Rüxün səthində aləmlər nümayan olmağın gördüm,
Yə'qinim oldu kim, ayineyi-giytinümasanmış.

Olubdur Kə'beyi-kuyin qamu aşiqlərə qiblə,
Mə'nayi-eşqdə zairlərə sə'yü səfasanmış.

Məta'a, məhcəbina, məhvəşavü mehriban, yara,
Cahanda əhli-ürfanə müta'vü müqtədasanmış.

Şüa'i-şəmsi-ruyindən münəvvərdir kəvakiblər,
Şəbi-zülmat heyrətdə məhi-leylüddücasanmış.

Ləbi-lə'lin kənarında yazıbdır xameyi-qüdrət,
Xəti-səbzilə kim, ətşanlara mailbəqasanmış.

Qalan bu külbeyi-hicran içində aşiqi-zarın,
Dili-suzanına daim dəvasanmış, şəfasanmış.

Əcəb miqnat kimi cəzb qıldın əqlimi sərdən,
Əzizim, gözlərim, canım, məgər ahənrübasanmış?

Siratəlmüstəqimə nuri-ruyin çəkdi Nəvvabı,
Necə Musanı Sinada əcayib rəhnüma sanmış.

## XAN QARADAĞİNİN ÖLÜMÜ MÜNASİBƏTİLƏ

Məni dildardan ayrı salan dildarsız qalsın,
Gül üzlü yarın təfriq edənlər yarsız qalsın.

Edən könlüm evin viran, salan hicrə məni-zari,
Dağılsın xaneyi-qəlbi, görüm me'marsız qalsın.



Edən viranə bülbül aşiyanını gülüstanda,
Pozulsun rövnəqi gülzarının, gülzarsız qalsın.

Məni biçarə, bikarə edən bazari-dəhr içrə,
Müşəvvəş nöqtəyi-qəlbi olub, pərgarsız qalsın.

Xudavənda, məni biqədr edən əğyarlar daim,
Hüzuri-yarda hər dəm, görüm miqdarsız qalsın.

Mənim könlüm quşun ol zülfdən rəm eyləyən səyyad,
Qırılsın dami-ömrü bazsız, şonqarsız qalsın.

Vüsali-yardan məhrum edən biçarə Nəvvabı,
İlahi, həşrə kimi şaxi-ömrü barsız qalsın.

* * *

Yarəb, nolur ki, rəhm edə yar yarə könlümə,
Şəhdi-ləbilə eyləyə bir çarə könlümə.

Nari-fəraqinə alışan sinəsi müdam,
Gül ruyindən gülab ura sədparə könlümə.

Şəms rüxilə cilvə edə Tur Sinayə,
Bir nurbəxş ola bu günü qarə könlümə.

Sövdayi-zülfü ilə düşən dəşti-heyrətə,
Vəslilə rəhnüma ola avarə könlümə.

Nəvvabə iltifat qılıb bir nəzər edə,
Bir çarə lütfilə edə biçarə könlümə.

* * *

Səthi-dümağ tapdı kədər dudi-ahla,
Hicrində ağlaram, gözəlim, salü mahla.

Heyhat, gər yetişsə əlim bir də vəslinə,
Etməm güman bu şövkəti bəxti-siyahla.

Əncümşümar gözlərini bu şikəstənin,
Olmaz ki, şad eyləyəsən bir nigahla.

Min gəz dedim usangilən, ey dil, usanmadı,
Çeşmi-xumara uyma o müjgansipahla.

Sınmış sipah bisərü pa rənci-ləşkəri,
Müşkil müqabil olmaq olur padşahla.

Et bərkənar tellərini ruyi-mahindən,
Şəmsin yüzünü tutma o miği-siyahla.

Nəvvab ahü nalə ilə vəslin axtarır,
Əfğanü zarü ədiyyayi-sübhgahla.

* * *

Əcəb düşdü başım qeylü qalə,
Qəmi-hicran məni saldı nə halə.

Dedim, ey dil, cəmali-yarə uyma,
Düçar etmə özün dərdi-məhalə.

Sözümü tutmadın, ey qanə dönmüş,
Düş indi zəhmətü rəncü məlalə.

Sənin hicrində, ey şux sitəmkar,
Vücudum gün kimi düşdü zəvalə.

Vüsalın görməmiş ovci-şərəfdə,
Düşübdür kövkəbi-bəxtim vəbalə.

Qəddi-şümşadımı döndərdi yayə,
Qəza cismi-zəifimi hilalə.

Rəqibin cövrünü, yarın cəfasın,
Çəkim mən, ya ki, bülbül kimi nalə.



Gül üzlü yar vəsli çıxdı əldən,
Fələk saldı məni yüz min xəyalə.

Sənin ahından, ey Nəvvabi-məhcur,
Gün ilə ay tutdu göydə halə.

* * *

Gəl əyləş, ey gözümün nuru, bir zaman, getmə,
Eşit bu dərdi-dilim çarə qıl, aman, getmə.

Gözün gözümə ötür ta görüm o gül yüzünü,
Danışgilən eşidim, ey şəkkərzəban, getmə.

Səni görəndə bu qəlbim gülü şüküftələnir,
Əgər ki, görməyəm ol dəm olur xəzan, getmə.

Tələttüf eyləgilən, kəsmə sayəni sərdən,
Tərəhhüm eylə ki, halım olub yaman, getmə.

Əgər gözümdən uzaq olsan, ey gözüm nuru,
Yə'qin qıl, sala gözdən məni zaman, getmə.

Əlim üzülsə o tubamisal qəddindən,
Dəxi mən istəmənəm hurü həm cinan, getmə.

Yə'qin eylə ki, sənsiz fəğanım ərşə çıxar,
Dəxi nə lazım olur cismim içrə can, getmə.

Ki, ta qiyamətədən doymanam vüsalından,
Fəraqə tab gətirməz bu xəstə can, getmə.

Gözü yüzündədi Nəvvabın, ey mələkmənzər,
Gecə-gündüz eşidər ahü əlaman, getmə.

## XAN QARADAĞİ HAQQINDA

Şəms ruyinə salıb cə'di-müsəlsəl sayə,
Guya gün tutulub, əksi düşüb dünyayə.

Çəkmə sərv qəddini ovcə, əya mehri-münir,
Aşiqin xəstədi, qoy üstünə düşsün sayə.

Turi-eşqində həmişə "ərni" zikr edərəm,
"Ləntərani" yetsə, gər necə yetib Musayə.

Şövqi-vəslü qəmi-əğyar, ələmü dərdi-firaq,
Düşməyim Qeys kimi bəs necə mən səhrayə.

Bu necə eşqü nə əğyarü nə vəslü nə firaq,
Nə yaman yerdə düçar oldu sərim sövdayə.

Gəh soraq eyləyirəm məscidi, gəhi deyri,
Şeyx Sən'an kimi düşdüm nə əcəb qovğayə.

Meyi-biğəşlə gər tutsa əlim piri-muğan,
Fariğ ollam, yetərəm mərtəbeyi-üzmayə.

Səri-kuyində qalıb canı əlində Nəvvab,
Xaki-payinə salam, müntəzirəm imayə.

* * *

Abad olu, könlüm evi meyxanə görəndə,
Viran olu, həm nərkisi-məstanə görəndə.

Eşq içrə yanan çoxdu Səməndər kimi narə,
Mən həm yanaram şəm'ilə pərvanə görəndə.

Leyla ilə Məcnunu edər yad dili-zar,
Hər mərhələyi-eşqdə divanə görəndə.



Fikrim var idi eyləməyim meyl nigarə,
Çarəm nədir ol məhvəşi məstanə görəndə.

Qəlbim evi viran olur qüssəvü qəmdən,
Hər səqfi sınıq damcılı kaşanə görəndə.

Xana degilən Ayişə, həm Baki zarə,
Zənn etməyələr kimsəyə peymanə görəndə.

İzhari-təşəkkür edərəm hər dəmü hər an,
Nəvvabı o məhru ilə həmxanə görəndə.

* * *

Dil eyləyir o qönçə ləblər arzu,
Mah tək camalın üzrə qara tellər arzu.

Şirin dahanın üzrə şəkkər, sözlərin müdam,
Fərhad kimi eşqə düşən illər arzu.

Könlüm quşu uçubdu vüsalın həvasına,
Kuyində dövr edər, yüzünü edər arzu.

Eşqin salıbdı Qeys kimi dəşti-firqətə,
Leyli həvası ilə edər çöllər arzu.

Hicrində odlaşan qanadı bu Səməndərin,
Ümmidi-vəslilən edir yüz şəhpər arzu.

Yə'qub tək yolunda bu xunbar gözlərim,
Yusifmisal vəslini eylər arzu.

Öz qanına xizab ola bu qanlı könlümü,
Səndən səvay eyləsə bir dilbər arzu.

Nəvvabə gər nəsib ola şəhdi-ləblərin,
Məhşər günündə eyləməz o kövsər arzu.

* * *

Qərarü ixtiyar əldən o məhru aşikar aldı,
Sanasan bir tülək tərlan şığıb yerdən şikar aldı.

Tükəndi taqətü tabım, mənə dərdü ələm qaldı,
Mədari-iqtidarım ol şəhi-gülgun səvar aldı.

Urub müjgan oxun hər dəm, kəsib aramımı təndən,
Necə Rüstəm qərarını əzəl İsfəndiyar aldı.

Gülüstan içrə sünbüllər şükuftə oldu, həm güllər,
Fəğanə gəldi bülbüllər, gülü şax üstə xar aldı.

Müsəlsəl cu rəvan oldu, bənəfşə sərgiran oldu,
Bəzəndi gülüstan səthi, yə'qin badi-bahar aldı.

Cahan gülzara döndü, leyk açmaz mənim könlüm,
Fəzayi-qəlbimi rəncü qəm, hicrani-yar aldı.

Xüsuf etdi qəmər, çün dudi-ahimdən kədərləndi,
Küsufə düşdü gün, dudi-dilimdən çün qübar aldı.

Edib təsxir, çün dili-kişvərin bu şuxi-bipərva,
Təni-suzanıma atəş urub, canım şərar aldı.

Gətirməz yadına Nəvvabı bir oğrun nigahilə,
Deməz eşqində biçarə, Səməndər kimi nar aldı.

* * *

Ey bivəfa, qoyubsan əcəb qalə tək məni,
Hicran odun əhatə edib halə tək məni.

Bilməm nə etmişəm sənə, zalım, nə zülmdür,
Etdin kabab, atəşi-cüvvalə tək məni.

Allah rizası, etməgilən xar eşqdə,
Aşiqlər içrə dağlama sən lalə tək məni.



Hər ləhzə gər üzülsə əlim qürbi-vəsldən,
Eylə yə'qin ki, yandırır səd salə tək məni.

Nəvvabı zarü zərd edib, oxşatdı firqətin,
Divari-qəmdə nəqş olan əşkalə tək məni.

* * *

Vahəsrəta ki, oldum o məhi-peykər ayrısı,
Bir mahru, firiştəliqa dilbər ayrısı.

Bir mahparə saldı məni dəşti-firqətə,
Tabım yoxkən eylədi min illər ayrısı.

Düşmüş xüsufə mah kimi can mədarda,
Olmuş rəqib cövrü ilə xavər ayrısı.

Bəzmi-vüsalə atdı fələk səngi-iftiraq,
Oldum cəfavü möhnətlən illər ayrısı.

Bülbül kimi nəvayə gəlib eylərəm fəğan,
Oldum çü gülüzarü səmən tellər ayrısı.

Tarac qıldı badi-xəzan gülüstanımı,
Bülbül ağladı, oldu qızıl güllər ayrısı.

Fərhad tək bağışladı Şirin rəvanını,
Nəvvab oldu çün o mahi-ənvər ayrısı.

* * *

Nuri-rüxün aşiqlərə əhbab degilmi?
Bayram ayı tək görməyə bitab deyilmi?

Ayinə nədir gül yüzünü etsə əhatə,
Əksi-rüxün ayinayə cəzzab degilmi?

Qaşilə gözün tir çəkib tutdu kamanı,
Can almağa bu hər iki pürtab degilmi?

Simin zənəxin, şəmsi-rüxün şə'şəə salmış,
İqlimi-dilə hər biri məhtab degilmi?

Minu kimi rüxsarın ara şəhdi-dəhanın,
Kövsər təki firdövsdə mirab degilmi?

Olmaqlığa sacid həcərüləsvad xalə,
Əbruyi-hilalın mənə mehrab degilmi?

Şovt etməgə beytüllahını, ey mahi-taban,
Ehrama girən dideyi-bixab degilmi?

Əğyarların canına, ey nəcmi-səadət,
Müjganın oxu əşhab ül-əşhab degilmi?

Xaki-dərinə səcdə edən çoxdu cahanda,
Sərkərdə o sacidlərə Nəvvab degilmi?

* * *

Sənin, ey aliyə, şe'rin məgər izhar olmazmı?
Dübarə ərzi-hal etmək məgər təkrar olmazmı?

Yetişdi aləmin şe'ri, qamu dəftərdə səbt oldu,
Yetə səndən yenə şirin, şəkər küftar olmazmı?

Nədən tutmuş bulud mahi-mübarək ayının ruyin,
Məgər badi-səba əsməz, bu mah əşhar olmazmı?

Deyirlər bir dənizadə buxalətlə xəbər vermiş,
Bəxilin zərfi-ömrü mövtlə sərşar olmazmı?

Mənim bu işdə nəf'im yox, sizə mə'lumdur, xahər,
Bunun zəhmətkeşi xəlq içrə bimiqdar olmazmı?

Qərəz, dünyada bu əş'ar bir asardır, qalsın,
Qamu şairlərin ismi məgər asar olmazmı?

Binayi-xeyrdir şairlərə kim, əzm edib Nəvvab,
Ona yar olmayan kəslər məgər əğyar olmazmı?



## MƏŞƏDİ HÜSEYN ADLI BİR ŞAİR NƏVVABA BELƏ DEMİŞDİR

Ağa, sənə yüz min dəfə dişdur[1] dedimmi, demədimmi?
Bir gün edərəm mən sənə şərü şur dedimmi, demədimmi?

Çox şayiq idim bir yetəm ol paki-hüzurinə, vəleykən,
Şüğlüm çox olub, olmadı məqdur, dedimmi, demədimmi?

## NƏVVABIN ONA CAVABI

Məşhədi, özünü eyləmə məcbur, dedimmi, demədimmi?
Ta olmayasan şərhdə məşhur, dedimmi, demədimmi?

Gəl Həccə tərəf əzm qılıb canını qurtar,
Ta olmayasan həşrdə məqhur, dedimmi, demədimmi?

Et vasitə, tut damənini ali-Rəsulun,
Muzdun puç olu, boş yerə muzdur, dedimmi, demədimmi?

Əl çəkməgilən ürvatül vüsqa ətəgindən,
Ta məscidi-Əqsa ola mə'mur, dedimmi, demədimmi?

Hər məclisara salma belə şuri-bəlağət,
Şurun sala bu aləmarə şur dedimmi, demədimmi?

Sürtüşmə bu şahbaz kimi təb'imə sail,
Çalma özünü qaynağa üsfur, dedimmi, demədimmi?

Güncüşk olur yox kimi şahini görəndə,
Ünqanı görən vaxtda bir mur, dedimmi, demədimmi?

Bir zaviyənin küncünə gir, bayqu kimi yat,
Xurşidi görən vaxtda şəbkur dedimmi, demədimmi?

Nəvvab olan bəzmdə, ey arifi-dövran,
Min bə'd danışma, dinmə, dişdur dedimmi, demədimmi?

[1] Dinc dur

## NƏVVABIN HƏSƏNƏLİ AĞAYİ XAN QARADAĞİYƏ ÜZRXAHLIĞI

Və'dələşdik, Xana ki, basəd şükuh,
Seyran edək məğğareyi-lə'li-kuh,
Lazım işlər düşdü, ğəm oldu ənbuh,
Hüzuruna yetmək mümkün olmadı.

Məhəmmədə tapşırdım ki, ey oğlan,
Xani-vala hüzuruna ol rəvan,
Ərz etgilən vəqaye'i-kəma-kan,
Seyrə çıxmaq bu gün mümkün olmadı.

O da gedib mücaviri göndərir,
Jamehir məl'un öz vaxtını itirir,
Nahar vaxtı ərzi sizə yetirir
Ki, xidmətə yetmək mümkün olmadı.

Cənabınız Lövhi ilə zəhmətə,
Düşdü dəxi Baki qəmü möhnətə,
Bu zəhmətlər saldı bizi xəcletə,
Hüzura çün yetmək mümkün olmadı.

Nəvvabınız sizə nəvaxan olub,
Bu qüssədən qəmi firavan olub,
Əfv eyləyin ki, əfv edən Xan olub,
Hüzura çün yetmək mümkün olmadı.

## SƏYAHƏT VAXTI NƏVVABIN XAN QARADAĞİYƏ YAZDIĞI ŞE'R

Əya Xan Qaradağiyə-vala,
Gəl indi seyr edək gülzarı, barı.

Şəqayiq bağrına dağlar qoyaq biz,
Bəşaşətlə keçirdək ruzigarı.



Edək məğğarəni lə'li-dirəxşan,
Dürəfşan eyləyək kuhsarü qarı.

Edib rəm nazla ahuyi-Çini,
Olub sate' necə müşki-tatarı.

Sənə Nəvvabdır yarü mədədkar,
Xudanın iltifatı etsə yarı.

* * *

Ey məhliqa, gəl eyləmə viranə könlümü,
Salma bəlavü möhnətü hicranə könlümü.

Bəsdir o zülmlər, mənə bu çərxdən yetib,
Qoyma dəxi cəfa oduna yana könlümü.

Zalım olubdu xalü xəttin, mahi-təl'ətin,
Zülmilə çəkdirir hərə bir yana könlümü.

Nərradi-eşq şeşdəri-heyrətdə mat edib,
Bir rah vermədi çıxa bir yana könlümü.

Zöhdü riya xərab qılıb xanimanımı,
Viran qıldı sübhəyi-səd danə könlümü.

Təsbihü teyləsani atıb tutmuşam səni,
Sən'an kimi buraxma biyabanə könlümü.

Əncümşümar olubdu bu xunbar gözlərim,
Bilməm nə vaxtadək salacaq qanə könlümü.

Cürmüm nədir, nə eyləmişəm, tövbələr edim,
Yandırma sən bu atəşi-suzanə könlümü.

Nəvvab ahü nalə ilə vəslin axtarır,
Eşqin salıbdı kuhü biyabanə könlümü.

* * *

Nə yar yad qılar, oynayıb güləndə məni,
Nə lütf edib çağırar, hər gəlib gedəndə məni.

Həqiqət əhlinə bir rəhm edib nəzər salmaz,
Yüzün kənarə tutar, kəc baxar görəndə məni.

Deyin o gül yüzə, şəhla gözə, o qönçə ləbə,
Bahar bülbülüm, sal yada güləndə məni.

Yadına çox salacaqsan uzun-uzun illər,
Fələk o sərvi-qədin "dal" tək əyəndə məni.

O vaxtda biləcək qədrü qiymətimi nigar,
Gedəndə rəngi-rüxi, ləbləri solanda məni.

Təravəti gedəcək gülbüni-bahar kimi,
Vəli, çox axtaracaqdır xəzan, öləndə məni.

Salar zəmanə gözündən, fələk kəsər lütfün,
Gəzər-gəzər, tapa bilməz zaman salanda məni.

Nə eyləyib ona Nəvvab kim, görəndə qaçar,
Nə lütf edər, nə kərəm, yüz tutar görəndə məni.

* * *

Nolurdu mahruyan olmasaydı,
Olaydı süsti-peyman olmasaydı.

Ümidi-vəsllə dilşad olurdum,
Əgər ki, nari-hicran olmasaydı.

Təvafi-Kə'beyi-kuyin edərdim,
Rəqibi-ziştbünyan olmasaydı.

Olurdum sərv tək qəmlərdən azad,
Qədi yarın xuraman olmasaydı.



Vəbalə düşməz idi ovci-iqbal,
Əgər eyvanda Keyvan olmasaydı.

Fəğanı bülbülün çıxmazdı hərgiz,
Gül üzrə xar xəndan olmasaydı.

Tapardı zindeyi-cavid Nəvvab,
Ləbində abi-heyvan olmasaydı.

* * *

O gül rüxsarına həsrət, nigara, yar olsunmu?
Dərində məhrəmi-razın sənin əğyar olsunmu?

O şirin ləblərin şövqilə dil, ey Xosrovi-xuban,
Təriqi-eşqidə Fərhad kimi, xar olsunmu?

Qalım Məcnun kimi həsrət sənə, ey Leyliyi-dövran,
Gəzim heyrət çölün, mənzil mənə kuhsar olsunmu?

Səməndər tək yanan eşq atəşinə bu dili-viran,
Cahanda Şeyx Sən'an kimi əşhar olsunmu?

Rüxi-mahin fəraqində kədər tapmış dili-viran,
Ziyayi-şəmsi-ruyinlə yenə ənvar olsunmu?

Vüsalın həsrətilə ruzü şəb Nəvvabi-biçarə,
Qəmi-eşqilə bülbüllər kimi xunbar olsunmu?

## NƏVVABIN ƏRDƏBİLLİ RÜSTƏM XANIN QIZI ZİBA XANIMA CAVABI

Pərişan etmə zülfü-ənbərəfşanı, Ağan canı,
Dağıtma səhfeyi-İranü Turanı, Ağan canı.

Pərişanlıq qəbul etməz ye'qin bu aləmi-imkan,
Tərəhhüm qıl, müşəvvəş etmə dünyanı, Ağan canı.

Pərivəş vurma şanə, ey pəri, zülfi-pərişanə,
Pərişan etmə hər dəm bu pərişanı, Ağan canı.

Pərişanlıq əgərçi rəsmdir zülfi-çəlipayə,
Müqəyyəd etməsən hər tarə min canı, Ağan canı.

Adın Ziba, qədin Tuba, yüzün hümrə, güli-rə'na,
Bu hüsnün nəqşə gəlməz gər çəkə Mani, Ağan canı.

Həvayi-lə'li-meygunin salıb şuriş Bədəxşanə
Ki, olmaz bir belə yaquti-rəmmani, Ağan canı.

Düşən eşqi-rüxün sövdasına, ey dilbəri-mahru,
Tökər əşki, içər hər dəm cigər qanı, Ağan canı.

Səməndər kimi yanmaq atəşi-hicranə asandır,
Ümidi-vəsl mə'mur etsə viranı, Ağan canı.

Təmənnayi-məhalın eyləyib məbhut Nəvvabı,
Təcəlla ilə məfqud etmə dünyanı, Ağan canı.

## NƏVVABIN GÖYÇƏ SAKİNİ CƏNAB HACI ƏLİ BƏY ƏMİRASLAN AĞAZADƏYƏ CAVABI

Əritdi cismü canım qüssəvü ahü fəğan, saqi,
Meyi-gülgunilə et tazə tər ruhu rəvan, saqi.

Mey içkən[1] dəm olur keyfiyyətim sərşar sağər tək,
Dolanım başına, etmə təəllüd, ver aman, saqi.

O meydən ver ki, qismət olmadı İskəndərə hərgiz,
Əgərçi həsrətilə seyr qıldı bu cahan, saqi.

[1] Mey içərkən



O meydən ver mənə kim arzusilə gedib xakə,
Olan bu aləmi-imkanə fərmanı rəvan, saqi.

Belə məst etgilən huşyar olum bir də qiyamətdə,
Tutum dəməni-cananı verim payinə can, saqi.

Yetişdi sinnimiz sitteynə hicri-ruyi mahində,
Sirişki-qəm töküb bülbül kimi olduq nəvan, saqi.

Bu dünya bivəfadır, uyma cahına, cəlalına,
Gülüstanı pozar nagah, yetər badi-xəzan, saqi.

Hanı şahini-ziləkrəm, hanı Musa, hanı Adəm,
Hanı İsa, hanı peyğəmbəri-Axirzəman, saqi.

Vəfası yoxdu dünyanın, cəfası əhlinin çoxdur,
Vəfa ünqa kimi mə'dum olub, yox bir nişan, saqi.

Çəkib Nəvvab özün bir guşəyə əhli-vəfa gözlər,
Əbəs zəhmət çəkir biçarə, yoxdur bir güman, saqi.

* * *

Yenə xunbar olan könlüm görüb ol şuxi-zibanı,
Odur bülbül kimi salmış cahana şurü əfğanı.

Görəndə şəm'i-rüxsarın, yanar pərvanə tək cismim,
Düşər mədhuş payinə, çəkər ahı, verər canı.

Məzəmmət yoxdu ol şəxsə ki, görməyib mahi-rüxsarın,
Nə etsin kor biçarə ki, görməz çeşmi-şəhlanı.

O çin zülfdə mürği-rəvanım aşiyan etmiş,
Pərişan olmasın, yarəb, görüm zülfi-çəlipanı.

Züleyxaya deyin fəxr etməsin Yusif camalına,
Gətirmiş çərxi-gərdun tazədən bir Yusifi-sani.

Necə ol mahruya baxmayım, şükr etməyim daim,
Nümayandır ol mahi-rüxsarda ayəti-sübhanı.

Dirildibsə Məsiha bir neçə əmvat ömründə,
Mənim yarım qılar hər dəmdə zində min məsihanı.

Olubdur nuri-ruyi cilvəgər cümlə cahan içrə,
Münəvvər eyləyibdir məscidi, deyri, kəlisanı.

Xəyali-ruyi-mahi rovzeyi-rizvandı Nəvvaba,
Olur niyran ona, görsə əgər bir ləhzə hicranı.

## RÜBAİ

Görmədim bir ləhzə mən azadə olsun könlümü,
Qüssəvü dərdi-ələmdən sadə olsun könlümü,
Gəşteyi-heyrət içində qalmışam Nəvvab tək,
Haliya, qərq olmağa amadə olsun könlümü.

* * *

Hicrində düşmüşəm çölə divanələr kimi,
Şan-şan edibdi sinəmi qəm şanələr kimi.

Qəm sağərini qanlı könül nuş edir müdam,
Sərşar olubdu xunla peymanələr kimi.

Məstan olubdu badəyi-eşqində kainat,
Nara yaxıblar canını pərvanələr kimi.

Mürği-xəyal gülşəni-ruyində bənd olub,
Ətrafi-arizində düşmən danələr kimi.

Səbrim evini ləşkəri-hicran edib xərab,
Mülki-vücudum eylədi viranələr kimi.

Nəvvabi-zar həsrəti-ruyinlə ruzü şəb,
Şeşdərdə mat olub büti-bütxanələr kimi.



* * *

...Bu səs mənə verdi can, can içrə ruhü rəvan,[1]
Gülüstani-vücudum oldu misali-cinan,
Din düşməni eşitcək bağırları oldu qan,
Məzhəbə şöhrət verir Qasım bəyin qələmi,
Millətə nüsrət verir Cə'fər bəyin ələmi.

Nə işlərdi ki, düşdük, cami-şəhadət işdük,[2]
Ata-baba yurdundan köçəri kimi köşdük,
Xof, rəca içində bir müjdəyə yetişdük,
Məzhəbə şöhrət verir Qasım bəyin qələmi,
Millətə nüsrət verir Cə'fər bəyin ələmi.

Bu kəslərin çox olsun bu dünyada, ey xuda,
Kami-rəva etgilən bunları şamü səba,
Dostların dərdləri tapdımı bu sözdən dəva,
Məzhəbə şöhrət verir Qasım bəyin qələmi,
Millətə nüsrət verir Cə'fər bəyin ələmi.

Ermənilər xar olsun, murdardı, murdar olsun,
Dünya durduqca görüm onları xunbar olsun,
Nə dərdi bir millətin, Əli ona yar olsun,
Məzhəbə şöhrət verir Qasım bəyin qələmi,
Millətə nüsrət verir Cə'fər bəyin ələmi.

Fərat yolun kəsibdir bu Şümüri-dun uşağı,
Şirə yağı olubdur görün duraq səbaqi,
Dünya baqi olduqca görüm ki, qalsın baqi,
Məzhəbə şöhrət verir Qasım bəyin qələmi,
Millətə nüsrət verir Cə'fər bəyin ələmi.

Nəvvab edər dualar belə şəxsə hər zaman,
Bu şəxslər yaşasın nə qədər vardır cahan,
Cəzada münzəl ola bunlara bağı-cinan,
Məzhəbə şöhrət verir Qasım bəyin qələmi,
Millətə nüsrət verir Cə'fər bəyin ələmi.

[1] *Bu şeir əvvəldən naqisdir.*

[2] Şairin fərdi dil xüsusiyyətləri saxlanılmışdır.

## QİT'Ə

İlahi, mərhəmətinlə bizə sən eylə kərəm,
Rəsuli-xəlqi-cahan iftixarı hörmətinə.

İlahi, məğfərətindən sən eyləmə mə'yus,
Bətuli-zarü fikarın məzarı hörmətinə.

Hidayət eylə bizi rahi-müstəqiminə sən,
Bu ərşü kürsivü lövhün mədarı hörmətinə.

Müsəllət etmə bizə ol kəsi ki rəhm etməz,
Rəsul itrətin ahü zarı hörmətinə.

Şərir əhli-cahanı iraq qıl bizdən,
Şəhidi-Kərbübəla şəhsüvarı hörmətinə.

Ləimü nakəsə möhtac etmə bizi,
Kərimü əhli-səxa tacidarı hörmətinə.

Tərəhhüm eylə, Nəvvabə etmə zarü zəlil,
Cəza günündə cəza hökmdarı hörmətinə.

## DÜNYANIN VƏFASIZLIĞI HAQQINDA

Həmdi-bihədd sənə, ey dadgəri-yövmi-cəza,
Sanei-ləmyəzəlü həyyü qədimü ə'la
Ki, nə ne'mətlər edibsən biz nadana əta,
Leyk küfran edib kim, oluruq hərzəvərə,
Hər zaman teyy edirik bədliklə rahi-xəta,
Rəhnüma eyləgilən lütfünü, ey bari-xuda,
Dəşti-heyrətdə qalıb söylərəm əz ruyi-səfa,
Hər zaman sidqilə key dadgəri-yövmi-cəza.
Tövbə, yarəbb, bexəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilməyib etdiklərimə.



Nitq verdin ki, edəm zikr sifatını əyan,
Əql qədrincə həman qüdrəti-zatını bəyan,
Yol dutam şəri'-nəbini olam ol rahə rəvan,
Şəm ol rahə edəm hübbi-Əliyyi-imran,
On bir oğlu ilə edəm sabit dinü iman,
Leyk biçarəm əz nəfsi-bədü bəd bünyan,
Sən mədəd qıl bu cihad içrə mənə, ey sübhan,
Qolyma dəstgir qalam vadiyi-heyrətdə, aman.
Tövbə, yarəbb, bexəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilməyib etdiklərimə.

Ey diriğa ki, əbəs ömri-əziz oldu fəna,
Keçdi gün bədliklə dərdü qəmü möhnət ara,
Heyf, səd heyf cavanlıq ki, olur badi-həva,
Qocalıq, vay, əgər cəngi-giribanə ura,
Bu hal ilə gələ gör kim, səfər üqbayə ola.
Dəst xali, yük ağır, mənzil uzaq, gecə qara,
Zərrəcən yox bir əməl, ta tuta əl ruzi-cəza,
Sən yetiş dadıma, ey dadi-rəsi-hər dü səra.
Tövbə, yarəb, bexəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilməyib etdiklərimə.

Vay o gündən ki, yetə qırğırıya can zi məhən,
Qövmü qardaş yığılıb bağlayalar çeşmü dəhən,
Qoyalar taxta kimi taxta üstə quru bədən,
Verələr qüslümü, örtə bədənzarı kəfən,
Qoya tabuta məni, şivən edə kudəkü zən,
Ola bir tirə olan cayi-bəni-zarə vətən,
Nə bir imdad edən ola, nə bir dadə yetən,
Sən yetiş dadıma, ey davəri zilcudu mənən.
Tövbə, yarəbb, bexəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilməyib etdiklərimə.

Bu bətər halilə ol dəmdə bəhökmi-Yəzdan,
Nagahan, zahir ola sovlətlə iki cavan,
Deyələr key əziz, ömrünü verən badə, oyan,
Söyləyəsən rəbbini, peyğəmbərini eylə bəyan,

Neylədin dünyada, söylə qamusun yaxşı-yaman,
Onların heybətindən lal ola dil, titrəşə can,
Bir belə vaxtda, ey Qadiri-qəyyumi-cahan,
Yetir imdadına mövlalarımı ahü aman.
Tövbə, yarəbb, bexəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilməyib etdiklərimə.

Gözü yolda, dili lal badili-məcruhü fikar,
Ol xətmak məkan içrə besəd zariyi-zar,
Yolunu gözlərəm, ey dadi-rəsi-ruzi-şümar,
Sən özün dadıma yet qəbrdə, ey cəddi-kübar,
Çünki Nəvvab nəvaxandı sizə leylü nəhar,
Eşqlə dərdkeş hübbi-Əliyyi-kərrar,
Çakərəm dərgəhüvə əbdir həşt, çahar,
Əfv qıl cürmümü, ey həyyü kərimü qəffar.
Tövbə, yarəbb, bexəta rahinə getdiklərimə,
Bilib etdiklərimə, bilməyib etdiklərimə.

## MİRZƏ CƏFƏR QASIMZADƏYƏ

Vəfa qıl əhdinə, sərkar Cə'fər
Ki, səndən özgəsinə yoxdu bavər.

Sənin əsrarını hər kimsə bilməz,
Sözün şirin, özün qəndi-mükərrər.

Degil agah, sənin sirrindən Agah,
Məmai, ya Həsən, ya özgə kəslər.

Qaradaği və ya Bakivü Növrəs,
Edə əş'arını min dəfə əzbər.

Məcazi sölə, yainki həqiqət,
Bilir əsrarını Nəvvabi-yeksər.



## TƏRCİBƏND

Narda qalıb həzrəti-xeyrül-bəşər,
Ümmətinə şövqlə etsin nəzər.

Ləşkəri-Yunanı necə tarü mar,
Eylədilər əskəri-fəthü zəfər.

Səngərini, toplarını bittamam,
Topi-şərərbarla zirü zəbər.

Qəl'ələrin xakilə yeksan qılıb,
Vəliəhdin eylədilər dərbədər.

Qürur edən ləşkəri ə'daların,
Ədəm diyarına qamu köçdülər.

Gəldi səda aləmi-əflakidən,
Söylədi ol dəmdə qəzavü qədər.

Sayeyi-alisi cahana müfid,
Çox yaşasın həzrəti-Sultan Həmid.

Şükr xudavəndə, ola hər zaman,
Lütf qılıb etdi bizi şadiman.

Batdı qəmü möhnətə ə'dayi-din,
Çəkdilər fəryadü fəğanü aman.

Saldı cahana necə gur-vəlvələ,
Ədhəmi-şirajənü bəbri-bəyan.

Şir kimi eylədi təxsir o dəm,
Şəhrləri zor ilə ol pəhləvan.

İgidlərin nə'rəsi, toplar səsi,
Zəlzələyə saldı sərasər cahan.

Fərzdir aləmlərə etsin dua,
Sidqlə key davəri-dadavəran.

Sayeyi-alisi cahana müfid,
Çox yaşasın həzrəti-Sultan Həmid.

Şəmsi-zəfər doğdu o gün aşikar,
Əskəri-islama olub nuri-bar.

Qreklərdən almaq üçün intiqam,
Nüsrətilə fəthi-qərin oldular.

Vəhşət edib ləşkəri-ə'da qaçıb,
Yatdı ələm, təbllər olub tarü mar.

Gurultusu qülləyi-Qafə düşüb,
Toplara çün topçular od qoydular.

Bombaları quş kimi teyran edib,
Düşmənə yağdırdılar narü şərar.

Bu qissə Nəvvabı edib şadiman,
Söyləyir hər dəmdə ki, ey Kirdgar.

Sayeyi-alisi cahana müfid,
Çox yaşasın həzrəti-Sultan Həmid.

Dostlar eşitdi bu sözü şad olub,
Dərdü qəmü qeyddən azad olub.

Əskəri-heybət əsəri Ədhəmin,
Nüsrət üçün qeybdən irşad olub.

Fələstinü Fəsaliya alındı,
Laris şəhri yeksərə bərbad olub.

Qlaqosu Ədhəm paşa alanda,
Padşahlar islaha bünyad olub.



Fəthnamə oxundu hər şərhdə,
Müsəlmanlar cümləsi dilşad olub.

Nəvvab o dəm əl-duaya götürüb,
Çünki qəmü qüssədən azad olub.

Sayeyi-alisi cahana müfid,
Çox yaşasın həzrəti-Sultan Həmid.

## İKİNCİ DƏFƏ BAŞ VERMİŞ ERMƏNİ-MÜSƏLMAN MÜNAQİŞƏSİNƏ HƏSR EDİLMİŞ ŞE'R

Qaçmağı hərbidə edən bünyad,
Nə əcəb özlərinə qoydular ad,
Qaçaram mən hər an çe badabad,
Belə əşxasə xoş deyib ustad,
Bər Yəzidü pəlidü İbn Ziyad,
Hər dəmi səd həzar lə'nətbad.

Bağat əhli tamam xürdü kübar,
Kufə əhli kimi olub qəddar,
Qaçdılar hərbidən o əhli şərar,
Etdilər özlərini lə'nə düçar,
Bər Yəzidü pəlidü İbn Ziyad,
Hər dəmi səd həzar lə'nətbad.

Geydilər tənlərinə cümlə kəfən,
Çəkdilər nalə, etdilər şivən,
Qayıdıb qaçdı mollayi-pürfən,
Neçə min şəxs mislü zəğü zəğən,
Bər Yəzidü pəlidü İbn Ziyad,
Hər dəmi səd həzar lə'nətbad.

Neçə əşxasi-xam, gürgi-məzac,
Nam, namusa hər biri möhtac,
Tə'nədən başlarına qoydular tac,

Özlərin lə'nə etdilər amac,
Bər Yəzidü pəlidü İbn Ziyad,
Hər dəmi səd həzar lə'nətbad.

Onlar ki difadan qaçdı,
Üzlərinə cəhənnəm açdı,
Qaçıban dağlar üstə dırmacdı,
Guya hər birin ilan sancdı,
Bər Yəzidü pəlidü İbn Ziyad,
Hər dəmi səd həzar lə'nətbad.

Məscidi yandırıb ərəmənü rus,
Hər iki qövm oldular mə'nus,
Rəhməti-həqdən olub mə'yus,
Var ümidim ki, iş ola mə'kus,
Bər Yəzidü pəlidü İbn Ziyad,
Hər dəmi səd həzar lə'nətbad.

Əhli-İranidən neçə minlər,
İstədilər gəlib kömək edələr,
Mane oldu olara qövmi-şərar,
Büxlilə hiylə etdilər neçələr,
Bər Yəzidü pəlidü İbn Ziyad,
Hər dəmi səd həzar lə'nətbad.

Beş gecə-gündüz oldu cəngü cədal,
Erməni qövmi oldular pamal,
Leş-leş üstə töküldü qövmi-zəlal,
Cümləsi oldu qərqi-bəhri-məlal,
Bər Yəzidü pəlidü İbn Ziyad,
Hər dəmi səd həzar lə'nətbad.

Verdi nüsrət xudayi-həmta,
Oldu məğlub ləşkəri-ə'da,
Rusiyəh oldu ol qaçan molla,
Lə'n daim olub ona imla,
Bər Yəzidü pəlidü İbn Ziyad,
Hər dəmi səd həzar lə'nətbad.



Dəxi, Nəvvab, bəsdi bu kəlimat,
Fikr edən vaxt təlx olur ovqat,
Qeyrəti olmayana xoşdu məmat,
Əsəbiyyətdi şəxsə fələki-nicat,
Bər Yəzidü pəlidü İbn Ziyad,
Hər dəmi səd həzar lə'nətbad.

## MİLLƏTİN BİRLƏŞMƏSİ HAQQINDA

Ayılın, millət, xabi-qəflətdən,
Qurtarın, qardaş, bu cəhalətdən.

Cümlə millətlər tapdılar rif'ət,
Saldılar ələ şə'nilə şövkət,
Cümləsi edər bizlərə töhmət,
Ayılın, millət, xabi-qəflətdən,
Qurtarın, qardaş, bu cəhalətdən.

Ey müsəlmanlar, amandır, aman,
Gülzari-dini etməyin xəzan,
Dərdimiz qalıb cümlə bidərman,
Ayılın, millət, xabi-qəflətdən,
Qurtarın, qardaş, bu cəhalətdən.

Əl çəkin bir dəm iftiraqdan,
Yapışın yeksər ittihaddan,
Qurtarın, qardaş, ehtiraqdan,
Ayılın, millət, xabi-qəflətdən,
Əl çəkin bir dəm bu cəhalətdən.

Millətlər hamı ittifaq alıb,
Aləm əhlinə vəlvələ salıb,
Bizim əhlimiz mat olub, qalıb,
Ayılın, qardaş, xabi-qəflətdən,
Əl çəkin bir dəm bu cəhalətdən.

Bu nə şurişdir, bu nə qovğadır,
Bu nə büğzü kin kim, hüveydadır,
Bu nə bəhsdir, qövli-bicadır,
Ayılın, qardaş, xabi-qəflətdən,
Əl çəkin bir dəm bu cəhalətdən.

İttifaq edib eyləyin səvab,
İftiraq etməyin manəndi-dəvab,
Doğru yoldur kim, göstərir Nəvvab,
Ayılın, qardaş, xabi-qəflətdən,
Əl çəkin bir dəm bu cəhalətdən.

## İKİNCİ DƏFƏ BAŞ VERMİŞ ERMƏNİ-MÜSƏLMAN MÜNAQİŞƏSİNƏ HƏSR EDİLMİŞ ŞE'R

Ey əziza, ibrət eylə, gərdişi-dövranə bax,
Sabitü səyyarədən hadis olan dastanə bax,
Dideyi-insafilən bir qövmi-bədbünyanə bax,
Qəl'ə içrə erməni qövmi edən tüğyanə bax.

Qımdatlar hər vilayətdən gəlib cəm'i-kəsir,
Qəl'ə içrə kin üçün cəm oldular bümavü pir,
Əhdi-peyman eyləyib, and içdilər qövmi-şərir,
Qımdatlar sərvəri Keki edən peymanə bax.

Minlərilə ram qıldı Qalaşayovu özünə,
Sürmeyi-rüşvət çəkib ol binəvanın gözünə,
Neçə min ermənilərı yandırdı zülmün közünə,
Qəl'ədə qalxızdığı bir beydəqi-əfğanə bax.

Qalaşayovlar saldılar bu qəl'əyə bir tazə şur,
Zülmü kinilən nümayan etdilər şuri-nəşur,
Qaldı bu kinü ədavət ta ölüncə nəfxi-Sur,
Bu iki qövmün içində qoydular, tufana bax.



On iki min ermənilə rus çün cəm oldular,
Dəstə-dəstə erməni səngərlərinə doldular,
Köçəri səmtində əvvəl toplara od qoydular,
Ah-vaveyla çıxıb eyvandan, Keyvanə bax.

Qalaşayovun buyruğuyla ruslar, kazaklar,
Neçə ə'yan evlərinə od qoyub yandırdılar,
Ermənilə yügrüşüb həm məscidə od vurdular,
Şö'ləsin qalxızdılar, ta dərgahi-sübhanə bax.

Köçərini Qalaşayov çün qətl-qarət eylədi,
Bigünah ol qövmə zülmi-binəhayət eylədi,
Qan töküb xunxar oldu, qanə adət eylədi,
Cümlə viran eylədi, bir etdiyi viranə bax.

Köçərini odladı ol dəmdə çün qövmi-züləm,
Əmr qıldı ləşkərinə, ermənilə həm qədəm,
Pəs müsəlman səmtinə qalxızdı zülmilən ələm,
Binəva millətlərin haqqında bir divanə bax.

Çün Məmayi səmtinə etdilər ol dəmdə güzər,
Neçə dəstə xacə Mircanlıya həm də keçdilər,
Hacı Rüstəm evlərini etdilər zirü zəbər,
Kim görübdür belə hakim, hökmə bax, divanə bax.

Çün müsəlmanlar bu işlərdən xəbərdar oldular,
Şiri-qürran kimi cümlə səngər içrə doldular,
Nə'reyi-Allahilə aləmləri doldurdular,
Tökdülər yağmur tək, gəl güllədən barana bax.

Seyyidü molla o dəm aldı ələ şəmşiri-kin,
Xəlqi tərğibi-difa etdi, çağırdı, ya müin,
Nasirül-müstəzifinsən, ya amanülxaifin,
Zalımın zülmünü gör, bir qoyduğu bünyanə bax.

Bir top atdılar müsəlmanlar o dəmdə nagəhan,
Ermənistan səmtinə vəhşət qılıb pirü cavan,

Oldu on səkkiz nəfər məqtul, ərmən verdi can,
Aləmi qovğayə saldı, şuri-bipayanə bax.

Zahir oldu ol zamanda neçə dəstə çün hümay,
Kürd tərəfdən nocovanlar cümlə çəkdi huy-hay,
Neçə güncüşk üstünə şahin şığar, ya qırçıqay,
Cümləsi tarac üçün oldu rəvan, talana bax.

İbrahim bəy bir tərəfdən kürdlərlə bidirəng,
Ermənistanə doluşdu, cümlə batopü tüfəng,
Erməni qövmilə ol dəm etdilər mərdanə cəng,
Leş-leş üstünə töküldü, nüsrəti-Yəzdanə bax.

Bir havayı güllə atdı ermənilər nagahan,
Dəgdi İbrahim bəyin ol güllədən tapşırdı can,
Azimi-rizvan olub, səd heyf, ol nazlı cavan,
Haqq yolunda baş verən, candan keçən cananə bax.

Neçə sərvər pişrov olmuşdular səngərlərə,
Qeyzə gəlmişdi təmamən, dönmüşdü əxgərə,
Oxşayırdı hər birisi qəhrdən şirü nərə,
Yox hərifi hər birinin, mərdi-dərmeydanə bax.

Cümləsi salar idi ol rəzmdə mərdi-dəlir,
Səddi-İskəndərdi, ruyintəndi, ya qürrəndə şir,
Sami-şirajəndi, ya Bijəndi, ya Gudərzipir,
Qan tökən, toplar sökən düşmənfikən bəbranə bax.

Xacə Mircan səngərini ermənilər nagəhan,
Top-tüfəngü bomba ilə etdilər onlar nişan,
Çığrışıb, urra çəkib min hiylə etdilər əyan,
Hiylələr nabud edən ol qadiri-sübhanə bax.

Ya Əli, çəkdi müsəlmanlar o vaxta bərqvar,
Gülləbaran etdilər ol qövmi çün əbri-bahar,
Rə'd kimi tökdülər ol qövmi-dun üstə şərar,
Davərin dadını gör, dadilə bir divanə bax.



Ermənilər qanını çün sel tək axıtdılar,
Cümləsi şadan olub məqsudə çünki çatdılar,
Hər qaraltı ki göründü cümləsini atdılar,
Xak-xun içrə düşən min qanına-qəltanə bax.

Beş gecə-gündüz müsəlman üstünə topü tüfəng,
Ermənilər tökdülər, həm ruslar etdilər cəng,
Atdılar həm evlərin üstünə minlərcən fişəng,
Top-tüfəngə baxma, amma qıldığı nöqsanə bax.

Özləri yandırdığı od onlara saldı şərar,
Yeddi yüzəcən qətlə yetdi cümləsi dil dağıdar,
Neçə yüzəcən güllə dəydi, düşdü cümlə zəxmdar,
Torpağa, qana bulaşmış qalibi-bicanə bax.

Ermənilərdən o qədri qətl olundu ol zaman,
Bir qəbrdə üç-dördün eylədilər nihan,
Qoydular üz qaçmağa ol dəmdə çün pirü cavan,
Aç bəsirət gözlərin, gər mərdsən meydanə bax.

Qalaşayov bu qissələrdən baxəbər oldu o dəm,
Əmr qıldı ləşkərinə, saldılar şeypura dəm,
Pəs keşişlər sülh üçün qalxızdı əczilə ələm,
Məscidə yüz qoydular, sən əhdə bax, peymanə bax.

Barışıq saldı belə zülmü sitəmlərdən sora,
Bir bu qədri qanları nahaq tökənlərdən sora,
Bir bu qədri zülm töxmünü əkənlərdən sora,
Cövrlə cari olan minlərcə nahaq qanə bax.

Millətin mədhini, Nəvvab, etgilən sən intişar,
Sahibi-qeyrətləri hifz eyləsin pərvərdigar,
Cümlə binamus üçün mənzil ola darülbəvar,
Bihəmiyyət şəxslər vasil ola, niranə bax.

## ÖZ XEYRİNİ FİKİRLƏŞƏNLƏRƏ

Yaran, nə eyləyək, işimiz ah-zar olub,
Haqq tovsəninə zülmlə batil süvar olub,
Nadan əzizü alim, rəbbani xar olub,
Mənsur kimi mənzilimiz payidar olub,
Gəldik cahana haqqı tapaq, molla qoymadı.

Gah mürşid ad qoyur özünə, gah müqtədir,
Dini-mübinə rəxnə salıb, eylər iftixar,
Təsbihü teylesan götürüb eylər inkisar,
Hər kəs əlinə düşsə onu fənnlə soyar,
Gəldik cahana haqqı tapaq, molla qoymadı.

Gah sufi məzhəbinə verir sidqlə rəvac,
Gah dəhri, gahi şeyxiliyə eylər ibtihac,
Gahi üsuli, gahi Kərimxanə ehtiyac,
İslam dininə salır hər biri e'vicac,
Gəldik cahana haqqı tapaq, molla qoymadı.

Halvanın eşqinə gahi dolma, gah tərək,
Min hiylə ilə tor quruban eyləyir kələk,
Doymaz qarınları necə ki doymayır nəhəng,
Hər nə danışsalar hamısı hiyləvü cəfəng,
Gəldik cahana haqqı tapaq, molla qoymadı.

Gahi deyir atamdı, babam əfzəli-cahan,
Olmuş mürid onlara həm pir, həm cavan,
Onlardan özgə yoxdu dəxi mürşidi-zaman,
Yox məndən özgəsi, dəxi dünyada bigüman,
Gəldik cahana haqqı tapaq, molla qoymadı.

Hər nə danışsalar hamısı lafdır yəqin,
Xudrə'yü xudpəsəndü kəlməbazü pürzi kin,
Avarə qoydu milləti bu rəxnesazi-din,
Təfriqi-ümmət içrə salıb etdilər qəmin,
Gəldik cahana haqqı tapaq, molla qoymadı.



Harda qalıbdı alimi-rəbbanilər, hanı?
Gün kimi rovşən eyləyə ta cümlə dünyanı,
Rövnəq verə şəriətə o elmlər kanı,
Nur ilə zülməti, əzizim, axtarıb tanı,
Gəldik cahana haqqı tapaq, molla qoymadı.

Nəvvab ərzi-hal edir şam, həm səba,
Hifz eylə bunların şəruşurindən, ey xuda,
Eylə hidayət onları, ya mövt, ya rica,
Bu ümməti-Məhəmmədiyə lütf qıl, əta,
Gəldik cahana haqqı tapaq, molla qoymadı.

* * *

Əya Xan Qaradağiyi-vala,
Ola şəni-şərifin bundan ə'la.

Kasıblara məhəl qoymaq yamandır,
Kasıblıqdan amanü əlamandır.

Gözüyün quyruğuyla bax yuxarı,
Silə bəlkəm kasıb dildən buxarı.

Savabdır kasıb əhvalını sormaq,
Kasıblar ilə həm durmaq, oturmaq.

Kimə mən söyləyim bu hali-zarım,
Keçinsinmi bu növ'i-ruzgarım?

Qalıb Nəvvab belə zarü müztərr,
Yuvasız quş kimi bibalü bipər.

## HACI ASLAN AŞUROVUN MƏDHİ

Aşurov, hamı ola qadirü qəffar sənə,
Cümlə dərdü ələmü möhnətdə yar sənə.

Şə'nü şövkətdə özün qütb olasan aləmdə,
Aləmin əhli dərində ola pərgar sənə.

Şəms iqbalını rovşən edə xəllaqi-cahan,
Baxalar həsrətlə düşməni-qəddar sənə.

Xahişi-qəlbinilə dövrə gələ çərxi-fələk,
Həm müavin olalar sabitü səyyar sənə.

Hamiyi-dini-mübin olmusan, ey əşcəyi-nas,
Əcəb eylərlər yə'qin müslimü küffar sənə.

Afərin qeyrətü namusuna ey kani-səxi,
Lənət olsun o kəsə eyləyə inkar sənə.

Malü candan keçibən din yoluna bəzl eylədin,
Sahibi-din ola peyvəstə, nigəh var sənə.

Əliheydər yaşasın, həm Əli İskəndərlə,
Hifz qılsın oları qadiri-muxtar sənə.

Eylə, Nəvvab, dualar belə əşxasə müdam,
O duada olasan kim, olub işhad sənə.



## ŞUŞA QALASINDA BAŞ VERMİŞ ERMƏNİ-MÜSƏLMAN MÜNAQİŞƏSİ MÜNASİBƏTİLƏ

Müsəlmana ermənilər durdu sataşmağa,
Qarınca tək Qalada qatışıb qaynaşmağa,
Qırallığın yolların üzlərinə aşmağa[1],
Başlarına böyüklük ciqqəsini saşmağa.[2]

Köçərlini ermənilər əzəlcə yandırdılar,
Xəlfəli qapısında evlərə od qoydular,
Neçə müsəlmanları şəhid edib soydular,
İlan kimi hər birin başladılar saşmağa.

Görən vaxta bu zülmü ermənidən müsəlman,
Difayə hazır olub cümləsi pirü cavan,
Nə'rə çəkib hər biri manəndi-şiri-jiyan,
Əllərində tüfənglər başladı atışmağa.

Hər səngərdə var idi bir müdəbbir pəhləvan,
O Rüstəmi-Zal tək hər biri şiri-jiyan,
Xalqı tərğib edirdi, mərdliyə hər zaman,
Namərdlik edənlər möhtac olur yaşmağa.

Bir neçə yüz o dəmdə çöldən gəlib atdılar,
Bir gecə rahat olub yeyib, içib yatdılar,
Ermənilər panbığın səhərəcən atdılar,
Dükanına, evinə durdular daraşmağa.

Qətl-qarət etdilər hər gələni, gedəni,
Bellərində tapança, əllərində suzəni,
Dayanmadı qabaqda bircə nəfər erməni,
Üz qoydular evlərə bir parası qaşmağa.

[1] Açmağa
[2] Sancmağa

Evlərə, dükanlara od qoydular müsəlman,
Yalo[1] çıxdı səmaya, bir yel qalxdı nagahan,
Yandı evdə, dükanda əksəri pirü cavan,
Sudxana[2], divanxana başladı alışmağa.

Ermənilərin yarısı od tutuban alışdı,
Şö'ləsi yanğıların Kərkicahana düşdi,
Övrət, uşaq bir-bir çığrışıban qarışdı,
Dedilər İsa gərək bu dügünü aşmağa.

Cəhənnəmin oduna bu dünyada yandılar,
İslamın həqiqətin böyük-kiçik qandılar,
Müsəlman igidlərin şirü pələng sandılar,
Aciz olub başladı yalvarıb yapışmağa.

Övrət, uşaq, cümləsi başlarını yoldular,
Ağacda yarpaq kimi titrəyib həm soldular,
Bir parası qaçıban kazarmaya doldular,
Xof, rəca içində başladı ağlaşmağa.

Davanın üç günündə kəlisanı aldılar,
Əzan deyib şad olub, naqusları çaldılar,
Bir günilə, bir gecə kəlisada qaldılar,
Başladılar erməni milləti çalışmağa.

Havayı neçə güllə gəldi o dəm nagahan,
Şahmar bəy şəhadət tapdı, o nazlı cavan,
Köçdü dünya evindən, mənzili oldu cinan,
Huri-qılmanla başladı danışmağa.

Az qalmışdı erməni bilmərrə olsun tamam,
Övrət, uşaq, cümləsi üz qoydular xassü amm,
Daşaltına qaçmağa Şahinidən çün himam,
Tədbir etdi böyüklər barışıb qarışmağa.

[1] Alov
[2] Məhkəmə



Bu dəmdə rus qoşunu muziklərin[1] çaldılar,
Papaqları ağacda havaya qalxızdılar,
Çala-çala gəldilər, məscidə çün çatdılar,
Çalışdılar hər biri sülh yolun aşmağa[2].

Bir böyük xaç əlində xəlfə oldu nümayan,
Yeddi aman baydağı, dövri-bərində ə'yan,
Neçə böyük erməni cümləsi zarü nəvan,
Boynu kəndirli gəlib keşişlər barışmağa.

Müsəlmanın ə'yanı dedilər ki, barışaq,
Bu davadan nə gəlir, yaxşı odur qarışaq,
Həmdəm olaq, yar olaq, hörmətlə danışaq,
Lazım deyil bir kəsə bu sülhdən qaşmağa[3].

Bu vaxtda nagahan cəm oldular cavanlar,
Dedilər ki, necə olsun nahaq tökülən qanlar,
İsa kimi ə'zası mismarlı pak canlar,
Vacib olub bizlərə ölüncə çalışmağa.

Aqibətbin olmayıb bir-birini yağladı,
Bu biməvqe barışmaq aləmləri dağladı,
Şad olmayan şəxslər qeyzə gəlib ağladı,
Qeyrətü namusdan az qaldı odlaşmağa.

Müsəlmana təəssüb vacibdi, Nəvvabi-zar,
Böylə fərman veribdir o rəsuli-tacidar,
Həmiyyəti olanı hifz eyləsin Kirdgar,
Qeyrətsiz əşxasla izn yox danışmağa.

[1] Musiqi
[2] Açmağa
[3] Qaçmağa

## NƏVVABIN HÜSEYN ƏFƏNDİYƏ CAVABI

Təxti-Osmanidə çün Sultanımız tutdu qərar,
Aləmi ədlilə doldurdu o şahi-tacidar,
Dostlar şad oldu, düşmənlər tamamən dağdar,
Saxlasın hifzü əmanətdə onu pərvərdigar.

Mərhəba olsun belə Sultani-cəmcahə müdam,
Ədlə bax, güncüşk şahinlə olmuş həmkinam,
Millәti-islam fəxr etsin belə şəxsə tamam,
Gəlməyibdir ali-Osmandan böylə ali mədar.

Millətin başın yetirdi kəhkəşanə bu vücud,
Böylə şəxsə düşmən olmaz, olsa gər adi-səmud,
Gər xudadan qeyrisinə caiz olsaydı sücud,
Səcdə etmək vacibdi millətə leylü nahar.

Zilli-zillüllahsan, ey mə'dəni-cudü səxa,
Oldular rahat sənin üsründə cümlə masiva,
Dövlətü iqbalını təbrik edər şahü gəda,
Olasan təxti-xilafətdə həmişə bərqərar.

Əhli-batil cümləsi lütfünlə haqqı tapdılar,
Şövqlə hər şəhrlərdə yaxşı mə'bəd yapdılar,
Hər yerə üz qoydular, nüsrət atını çapdılar,
Beydəqi-fəthü zəfər urdular orda aşikar.

Rum eli getdi, əgər Yunanzəmin gəldi ələ,
Larisə, həm də Fələstinə düşəndə vəlvələ,
Görmədinmi, ya ki, gördün bir gətirməzsən dilə,
Olmasın, yarəb, bir kəs cəhlilə cəhlə düçar.

Yoxdu dünyanın içində sən kimi zülehitşam,
Gün kimi afaqı tutmuş şövkətü şə'nin tamam,
Xaliqi-ərzü səma iqbalın etsin müstədam,
Düşmənin xaki-dərində cümlə olsun xaksər.



Et dua bu həzrəti-valaya sən Nəvvabi-zar,
Hər zamanü hər dəmü hər ləhzədə leylü nahar,
Gəlməyibdir, dəxi gəlməz bir belə alitəbar,
Hifz qılsın öz amanında bunu pərvərdigar.

## HƏSƏN LƏLƏNİN ŞE'RİNƏ BƏDİHƏ

Yenə bilməm nə var gülzar içində,
Gəlir məgər bülbüli-şeyda səsi?
Əndəliblər fəğanü fəryad edər,
Ya ki, gəlir bir güli-rə'na səsi?

Gözlərimin yaşı dönüb sellərə,
Sən'an kimi düşdüm əcəb dillərə,
Məcnunsifət yenə düşdüm çöllərə,
Gələn dəmdə guşimə Leyla səsi.

Sərv kimi qəddi xuraman olan,
Şəhdi-ləbi dərdlərə dərman olan,
Qönçə kimi ləbləri xəndan olan,
Nərkis kimi gözləri şəhla səsi.

Kimdi cahan içrə günü tar ola,
Mənsur tək mənzil ona dar ola,
Eşqdə Vamiq kimi sərdar ola,
Vadiyi-qəmdən gələ əzra səsi.

Bulud kimi gözləri qəmdən dolan,
Fəraqında gül kimi rəngi solan,
Badeyi-eşqində içib məst olan,
Neyləyəcək sağərü səhba səsi.

Cilveyi-didarına aşiq olan,
Vadiyi-hicranda saralıb-solan,
Nəvvab tək bisərü saman qalan,
Kimdi salan aləmə qovğa səsi.

## SAMOVARIN TƏ'RİFİ[1]

Mərhəba qamətinə, ey büti-dövran samovar,
Ey olan, aləm içində, rahəti-can samovar,
Görüm həqq etsin səni hər ləhzə xəndan samovar,
Olasan dəhrdə, hər vaxtda rəxşan samovar,
Səninlə olu xoşnud, həmişə mehman samovar.

Samovardır bu cahanda aşiqə məhrəmi-raz,
Məşuqə həmdəm olur, ruz-şəbhayi-diraz,
Ola bir bəzmdə gör tənbürü ney, udla saz,
Samovar ki çəkməyə sövt, nəvailə hicaz,
Məclisin rövnəqi olmaz, olsa pünhan samovar.

Samovarın şərti var, ey sahibi-əqli-şüur,
Əvvəla suyu onun şirin ola, köhnə nə şur,
Çayı papo ola, həm qəndi ola misli büllur,
İçəsən iki-üçü, ta dolana beş dəfə dövür,
Biləsən dünyadadır dərdlərə dərman samovar.

Bunları çün yetirin itmamə, ey qaşı-qələm,
Qoygilən padnosa nəlbəkini, eyləmə qəm,
Eylə məhrabə ilə stəkanın çirkin ədəm,
Salgilən od, necə gör başlayacaq zirilə bəm,
Necə gör söyləyəcək nəğmeyi-dastan samovar.

Əvvəla, zümzümədə Şur, dalınca Şəhnaz,
Mə'novi, məsnəvi, həm Şiştərü suzilə güdaz,
Saniyən, şəddeyi-əraqilə gedəcək tabə Hicaz,
Nə Humayunu, nə Fe'li, nə Bayatı-Şiraz,
Deyəcək nəğmeyi-hudey, necə sarban samovar.

İstərəm kütəh edim tə'rifin, ey şirin məzaq,
Çünki gördüm atəşin, yadə düşər nari-fəraq,
Ümidim var, hifz edə Möhsünü Sahibi-büraq,
Düşməyə hicrə dəxi, görməyə heç nari-fəraq,
Kəs səsin, söyləmə, ey natiqi-bican samovar.

---

[1] M.M.Nəvvabın 13 yaşında ikən yazdığı bu şeir oğlu Miribrahim Ağamirzədənin 1935-ci ildə köçürtdüyü və Əlyazmalar İnstitutunda saxlanan B-2721 şifrli əlyazma kitabındakı "Divan"dandır.





## PİŞVAQİƏ VƏ İKİ BEYT

Gül üzünü açgilən ta bülbüli-zar ağlasın,
Vəsli-ruyin həsrəti leylayi-ofkar ağlasın.

Aftab ruyini zülf içrə pünhan eyləmə,
Mahi-rüxsarın görüb ta qövmi-əşrar ağlasın.

Nizədə etsin təcəlli nuri-ruyi-Mustafa,
Qişvə tutsun cümləsin qövmi-sitəmkar ağlasın.

Nadim olsun qatilin, o təl'əti-mahın görüb,
Mərrə ibni-Münqəzü Xuliyi-qəddar ağlasın.

Qərqi-dəryayi-qəm olsun cümlə zərrati-cahan,
Cari etsin göz yaşı əşcarü onhar ağlasın.

Bu belə matəmdi aləmlər gərək qan ağlayıb,
Sinəçak olsun, qələm-dəftərdə əş'ar ağlasın.

Qara geysin əyninə daim şəbi-yəlda kimi,
Şurü əfqan eyləyib Nəvvabi-xunbar ağlasın.

* * *

Yarəb, kimin əzasıdı, belə olub əyan?
Batmış əzaya əhli-cahan eyləyir fəğan.

Ney tək nəvaü nalə edir zar əndəlib,
Solmuş məgər ki, badi-xəzan ilə gülüstan?

Qəltan olubdu xak ilə xunə məgər Hüseyn?
Əhli-cahan olubdu belə əşki-xunfəşan.

Ətşan kəsibdü Şümri-şəqi başını məgər?
Ya Əkbəri cavanı susuz tapşırıbdı can.

Cinnü mələk geyibdü qara, şurişin edir,
Cümlə səda-sədayə verib ah edir aman.

Tutmuş Hüseyn əzasını yekbarə kainat,
Qara geyib səhab, çəkər nə'rə asiman.

Sahibi-əza olubdu Xudavəndi-zülcəlal,
Cari edir sirişki fələk, əşki-qəm rəvan.

Nəvvabi-zar başə vurub, ya Hüseyn deyir,
Şuriş salır cahanə, cahanı edir nəvan.

## HƏZRƏTİ-SEYYİDÜŞ-ŞÜHƏDA ŞƏHRƏBANUNU NALAN GÖRÜB BUYURDU:

Ey növşüküftə, novgüli-gülzarım, ağlama!
Bu qəm çölündə munisü dildarım, ağlama!

Sənsən mənim ənisi-dilim, həmdəmim bu gün,
Pürdağ qılma sineyi-əfgarım, ağlama!

Sən ağlayanda qəlbim evi dərd ilə dolur,
Səbr etgilən bu möhnətə, qəmxarım, ağlama!

Al mehribanlıqla kənarə Səkinəni,
Nalan olur o bülbüli-gülzarım, ağlama!

Xar olmuşam mən, ey şəhi-dövranım, ağlaram,
Olmuş şəhid cümlə mədədkarım, ağlama!

## ŞAHZADƏ ŞƏHRƏBANU AHİ-SUZNAKLA CAVAB ƏRZ ELƏDİ:

Xar olmuşam mən, ey şəhi-dövranım, ağlaram,
Əldən gedir sənin kimi sultanım, ağlaram.

Qorxum budur ki, əhriməni-Kufiyan səni,
Dəstgir eləsinlə süleymanım, ağlaram.



Can vermişəm sənin kimi cananə yetmişəm,
Lərzan olubdu cismim ara canım ağlaram.

Bülbül kimi nəvayə gəlib eylərəm fəğan,
Solmuş xəzan yeli ilə gülüstanım, ağlaram.

Bu qəm çölündə Əsğərimin nari-firqəti,
Odlandırıbdı sineyi-suzanım, ağlaram.

Qəddi-büləndi Əkbərin, ey şahi-kəmsipah,
Düşmüş yerə, o sərvi-xuramanım, ağlaram.

Nəvvabi-zar növhə edir hər zaman bizə,
Hər dəm deyir ki, şahi ləbətşanım, ağlaram.

## QƏRİB LEYLİNİN DİLİNDƏN

Ey məhi-növ, niyə tez pərdədə pünhan oldun?
Ey səhi-qədd, məgər xak ilə yeksan oldun?

Şəmsi-rüxsarına nə oldu ki, belə etdi küsüf?
Ey qəmər üzlü, məgər əbrdə pünhan oldun?

Etməmiş qönçə kimi xəndə bu gülzarda sən,
Gül kimi nə oldu ki, pəjmürdəvü xəndan oldun?

Sərsər badi-xəzan dəydi vücudinə məgər?
Ey bahar üzlü cavan, belə pərişan oldun?

Gül kimi qana bulaşmağını yad eyləmədin,
Tiği-zülm ilə belə qanına qəltan oldun.

Xoşuna gəlmədi güzari-cahan, üz çevirib,
Yarü yoldaşı qoyub azimi-Rizvan oldun.

Yoxdu, Nəvvab, bu dünyada vəfa ilə xəyal,
Bu rübati-köhənə bir gecə mehman oldun.

## ORUCLUĞUN SON GÜNLƏRİNDƏ ORUC TUTANLARIN ETDİYİ DUA

İlahi, mərhəmətinlə bizə sən elə kərəm,
Rəsuli-xəlqi-cahan iftixarı hörmətinə.

İlahi, məğfərətindən sən eləmə mə'yus,
Bətuli-zarü fikarın məzarı hörmətinə.

Hidayət elə bizi rahi-müstəqiminə sən,
Bu ərşü kürsivü lövhün mədarı hörmətinə.

Müsəllət etmə bizə o kəsi ki, rəhm etməz,
Rəsul itrətinin ahü zarı hörmətinə.

Şərir əhli-cahanı iraq qıl bizdən,
Şəhidi-Kərbübəla şəhsüvarı hörmətinə.

Ləimü nakəsə möhtac etmə bizi,
Kərimü əhli-səxa tacdarı hörmətinə.

Tərəhhüm elə bu Nəvvabə, etmə zarü zəlil,
Cəza günündə cəza hökmdarı hörmətinə.

## CƏNABİ-NƏVVABIN NÖVHƏSİ

Va həsrəta ki, oldum o mahpeykər ayrısı,
Bir mahru, firiştəliqa dilbər ayrısı.

Düşmüş xüsufə mah kimi can mədarda,
Olmuş rəqib cövri ilə xavər ayrısı.

Bəzmi-vüsalə atdı fələk səngi-iftiraq,
Oldum cəfavü möhnətlən illər ayrısı.

Tarac qıldı badi-xəzan gülüstanımı,
Bülbül dağladı, oldu qızılgüllər ayrısı.



Qan ağla gözlərim, o şah öldü zülmlən,
Abbasü Ovnü Fəzlü cavan Cə'fər ayrısı.

Düşdü həbutə kövkəb-iqlabı Zeynəbin,
Zülmü sitəmlə oldu bəradərlər ayrısı.

Zarü zəif eylədi Leylayi-bikəsi,
Mah tək məhaqə saldı Əliəkbər ayrısı.

Fərhad tək baxışladı Şirin rəvanını,
Nəvvab oldu çün o şəhi-ənvər ayrısı.

## NÖVHƏ

Könlüm o Neynəva çölünü eylər arzu,
Gül kimi qanına bulaşan peykər arzu.

Dörd min yaralı cismini ol şahi-bikəsin,
Xak ilə xun içində düşən bisər arzu.

Tuba misal qəddini Abbasi-sərvərin,
Zülm ilə həm cida olunan qollar arzu.

Şibhi-Peyəmbərivü cavan hünərvəri,
Yə'ni qəddi-büləndi-Əliəkbər arzu.

Qandan olan xizab o zülfi-müənbəri,
Nakam olan o Qasimi-gülpeykər arzu.

Şimşadü sərvü nəxli-tənavər kimi düşən,
Xak üzrə Ovnü Fəzlü cavan Cə'fər arzu.

Məcruh olan boğazı o peykani-zülmlən,
Dəşti-sitəmdə qönçə kimi Əsğər arzu.

Nəvvab, ol qəribi-şəhənşəhə ziyarətin,
Hər ləhzə həm şəfaətini eylər arzu.

## NÖVHƏ

Bikəs qalan Hüseyn vay, ətşan olan, Hüseyn vay!
Əhlü əyalı qəmdən gültək solan, Hüseyn vay!

Düşən qumlar üstünə cismi cinanü xəncər,
Qalan heyrət çölündə məzlumü zarü müztər,
Xak ilə xun içində nə'şi-Əliəkbər,
Abbas tək cavanı qolsuz qalan, Hüseyn vay!

Ərşi-ə'layə çıxdı şurü fəğanü ahım,
Qardaşlarım qırıldı, qalmadı bir pənahım,
Səndən sonra Hüseynim, odlandı xeyməgahım,
Dağıldı xanimanım, oldu talan, Hüseyn vay!

Aləm xarab olaydı qana batanda Əkbər,
Qana dönəydi dövran, peykan əməndə Əsğər,
Ah ol zaman ki, düşdü bisər gülgün kəfənlər,
Cismi-şərifi üryan, qana qəltan, Hüseyn vay!

Əlim səndən üzüldü, naləm çıxdı səmayə,
Qərq olmuşam, Hüseyn can, bəhri-qəmü bəlayə.
Kimə deyim dərdimi, kimlər yetsin haraya?
Gəl et dərdimə dərman, dərdə dərman, Hüseyn vay!

Qardaş, əhli-əyalın məcruh, zar, xəstə,
Şümr sinan əlində zənciri-zülmə bəstə,
Bülbül kimi Səkinə naləndı, pərşikəstə,
Başın cidalar üstə, getmə, dayan, Hüseyn vay!

Bikəs ərusi-zarım soyuldu toy libası,
Ahı çıxıb səmayə, var Şümürdən hərası.
Gər iltifat qılsan, göndər gəlsin Abbası,
Qaldım qürbət elində, didərgiryan, Hüseyn vay!

Biçarəvü qəribəm, ey şahi-tacdarım,
Pərbəstə əndəlibəm, ey növgüli-baharım,



Bu dərdü qəm içində yox kimsə qəmküsarım,
Qoyma Şamın yolunda zar-nalan, Hüseyn vay!

Sındırdı qövmi-üdvan misaqi, əhd, peyman,
Ol dəşti-kin içində olmadı bir müsəlman,
Şövqi-dəlilə olsun ol kəmsipahə qurban,
Nəvvab qurban edir başilə can, Hüseyn vay!

## MİR MÖHSÜN AĞA NƏVVABIN KƏLAMI

Ey məhi-ənvari-hidayət, Əli!
Məxzəni-əsrari-vilayət, Əli!

Ey kərəmin mənbəi, salari-din,
Həbbi olan aləmə həblülmətin,
Baisi-icadi-səmavü zəmin,
Farisi-meydani-şücaət, Əli!

Lütf ilə qıl birce nəzəri, baba,
Gör neco Zeynəb qalıb heyrətara,
Virdi olub va əbta, va əxa,
Kimdi çəkon belə müsibət, Əli!

Oxşayıram Əkbəri, gah Əsğəri,
Gah Əbülfəzli-hünərpərvəri,
Ovni-dəliriyü cavan Cə'fəri,
Ahım edir dərdimə şirkət, Əli.

Çevrəm alıb bir bölük əhlü əyal,
Cümləsi müstəğriği-bəhri-məlal.
Cari edir sel kimi əşki-al,
İtrəti-pakın belə zillət, Əli!

Qorxum odur kim, çəkə Şümri-lə'in,
Kufəvü Şamə bizi əz rahi-kin.

Edə şəmatət bizə ə'dayi-din,
Olmaya bir sahibi-qeyrət, Əli.

Silsileyi-möhnətdə üstüvar,
Abidi-bimar, zəifü nə zar.
Gah beqəş əndərü, gəh biqərar,
Həmdəmidir rənc ilə möhnət, Əli.

Ağlaram ey şah, besəd şürişin,
Göz yaşıma qərq edərəm aləmin.
Vird edərəm, vay Həsən, vay Hüseyn!
Öldürə ta bu qəmü zillət, Əli!

Kərbübəla dəşti olub laləzar,
Nə'şi-Hüseynim qalıbdı bimozar.
Peykəri-üryani-şəhidan fikar,
Eylə mədəd, ey məhi-rüf'ət, Əli!

Möhsini-Nəvvab olub növhəgər,
İtrəti-ətharına ey dadgər.
Qoyma onu dünyada xuninciyər,
Həşrdə, həm eylə himayət, Əli.

## NÖVHƏ

Öylə müştaqi-cəmaləm, bilmənəm dünya nədir?
Talibi-bəzmi-vüsaləm, bilmənəm dünya nədir?

Ey camaat, təşnəsiz çün bu mütəhhər qanıma,
Razıyam yüz min yaralar gər yetişsə canıma.
Ruhumu lahutda bəzl etmişəm cananıma,
Aləmi-ünsürdə bu sevda nədir, səfra nədir.

Öylə müştaqi-cəmaləm, bilmənəm dünya nədir,
Talibi-bəzmi-vüsaləm, bilmənəm dünya nədir.



Mən vətəndən ol zaman kim, zari-giryan köçmüşəm,
Şövq ilə canan yolunda başü candan keçmişəm.
Aləmi-mə'nada mən cami-şəhadət içmişəm,
Aləmi-zahirdə bu mina nədir, səhba nədir.

Öylə müştaqi-cəmaləm, bilmənəm dünya nədir,
Talibi-bəzmi-vüsaləm, bilmənəm dünya nədir.

Gər yanam eşq atəşinə, şaiqəm Musa kimi,
Payi-darə çəkiniz min gəz məni İsa kimi.
Başımı qət eləsəniz hər dəm əgər Yəhya kimi,
Nuşi-candır, bilmənəm xəncər nədir, ə'da nədir.

Öylə müştaqi-cəmaləm, bilmənəm dünya nədir?
Talibi-bəzmi-vüsaləm, bilmənəm dünya nədir.

Eylərəm təkrar "Əmi" çünki adətdir mənə,
Gər yetişsəm "Lənterani" çox qənimətdir mənə.
Dostdan yüz min bəlalar eyni-ləzzətdir mənə,
Bu şəhadət vadisidir, "Lən" nədir, "Ləmma" nədir?

Öylə müştaqi-cəmaləm, bilmənəm dünya nədir?
Talibi-bəzmi-vüsaləm, bilmənəm dünya nədir.

Mən gərəkdir kim bu gün vasil olam cananıma,
Min sinanü tiğü xəncər gər vurulsa canıma.
Bu məhasinim gərəkdir kim bata al qanıma,
Azizəm, çün bilmənəm dünyavü mafiha nədir.

Öylə müştaqi-cəmaləm, bilmənəm dünya nədir?
Talibi-bəzmi-vüsaləm, bilmənəm dünya nədir.

Bu şəhadətdə gərək babama təqlid eləyim,
Dəstəmazımı bu gün qan ilə təcdid eləyim.
Səcdədə mə'budumu təhmidü təmcid eləyim,
Sacidə məscid nədir, mə'bəd nədir, səhra nədir.

Öylə müştaqi-cəmaləm, bilmənəm dünya nədir?
Talibi-bəzmi-vüsaləm, bilmənəm dünya nədir.

Min qəmü möhnət ara saldız bu şahi-bikəsi,
Şeşdəri-heyrət ara saldız bu şahi-bikəsi,
Qərqi-dəryayi-fəna etdiz bu şahi-bikəsi,
Daxi bir biyar üçün bu şurü bu qovqa nədir.

Öylə müştaqi-cəmaləm, bilmənəm dünya nədir?
Talibi-bəzmi-vüsaləm, bilmənəm dünya nədir.

Yarü ənsarım gedib biyarü yavər qalmışam,
Bu bəla dəştində mən zarü mükəddər qalmışam.
Nim bismil quş kimi bibalü bipər qalmışam.
Gülşənim tarac olub, bülbül nədir, şeyda nədir.

Öylə müştaqi-cəmaləm, bilmənəm dünya nədir?
Talibi-bəzmi-vüsaləm, bilmənəm dünya nədir.

Ərğəvan kimi boyanmış Qasimi-gülpeykərim,
Sərvqədd qardaşlarım, gül üzlü nazlı Əkbərim.
Qönçəvəş pürxun düşüb xakə Əliəsğərim,
Bilmənəm sünbül nədir, susən nədir, rə'na nədir.

Öylə müştaqi-cəmaləm, bilmənəm dünya nədir?
Talibi-bəzmi-vüsaləm, bilmənəm dünya nədir.

Ya Hüseyn, ey xaki-payin aləmin başına tac,
Ey şəhadətlən verən İslam dininə rəvac.
Etgilən Nəvvabi-zarın dərdi-zarına əlac,
Cəzb qıl ta bilməsin dünya nədir, üqba nədir.

Öylə müştaqi-cəmaləm, bilmənəm dünya nədir?
Talibi-bəzmi-vüsaləm, bilmənəm dünya nədir.



## NÖVHƏ

Nə matəmdir ki, yarani-Heydər ağlar?
Şəhənşahi-cahan peyğəmbər ağlar?

Məgər növrəstə Qasim kədxüdadır?
Və ya Əkbəri-cavan sərdən cidadır?
Məgər sahibəza yarani-Xudadır?
Ki, göylərdə məlayik yeksər ağlar.

Nədən Məryəm geyib əyninə qara?
Məgər İsa çəkilmiş payi-dara?
Məgər tufan olub Nuhə dübarə?
Ki, göz yaşı ilə tufan eylər, ağlar?

Bəni-adəm batıb, yeksər qarayə,
Düşübdür ahü fəğan məsəvayə.
Kəlimülla salıb şivən səmayə,
Şəhidi-təşnəkamı oxşar, ağlar.

Düşüb bisər qamu gülgün kəfənlər,
Bulaşmış qanına gül tək bədənlər.
Edib Bilqeysi dəstgir əhrimənlər,
Süleyman bəlayə, divlər ağlar.

Əyalini çü gördü zillət ilən,
Bəla dəştində yüz min möhnət ilən.
Dizin qucmuş həzaran həsrətlən,
Susuz oğlum deyib, Peyğəmbər ağlar.

Çəkən vaxta Səkinə ahü anı,
Tutardı şö'leyi-ahı cahanı.
Əli belində dolanır Kərbəlanı,
Əliəkbərinə Heydər ağlar.

Dayandı əhli-beytin ərşə ahı,
Alışdı zülmlən çün xeyməgahı.

Gəzər xatun məhşər qətlgahı,
Tökər nə'ş üstə zülf ənbər ağlar.

Edər zərrati-aləm cümlə əfqan,
Ölüb Kərbübəla mehmanı ətşan.
Edib Zeynəb o mişkin zülfün əfşan,
Gəhi Əkbər deyib, gəh Əsğər ağlar.

Düşüb atdan məgər səqqayi-məzlum
Ki, olmuş pirü bürna cümlə məğmum.
Başa salmış qaranı Ümmigülsüm,
Deyər Abbasü Ovnu Cə'fər ağlar.

Cərahət tapdı çün şəhzadə Əkbər,
Boyandı qanına zülfi-müənbər.
Züleyxayi-Hüseyn, Leylayi-Əkbər,
Səpər başa dəmadəm güllər, ağlar.

Yaralı növcavanına Hüseynin,
Yetim övladına ol nuri-eynin.
Gecə-gündüz dolanır ay ilə gün,
Tökər yer üzrə yüz min əxtər, ağlar.

Xəcalət tifllərdən şahi-ali,
Nə rəngi üzdə, nə dildə məqali.
Səkinə tutmuş əldə cami-xali,
Gözü yolda, əmisin gözlər, ağlar.

Edib Havva fəğan, Sara açıb baş,
Çü qaldı şahi-din biyarü yoldaş.
Geyib Kə'bə qara, Zəmzəm tökər yaş,
Nə Zəmzəm, xüld içrə kövsər ağlar.

Çü Qasim görmədi dünyada kamın,
Yanar bişö'lə, qəlbi xas-amın.
Susuz övladına təşnə imamın,
Səpər Nəvvab başa güllər, ağlar.



## NƏVVABIN ŞAHZADƏ QASIMA YAZDIĞI NÖVHƏ

Qasimin səthi-rüxündə yədi-beyza görünür,
Məh cəbinində əyan, nuri-təcəlla görünür.

Vəzzüha mahi-rüxü leyli-düca, zülfi-xəmi,
Şəmsi-rüxsarı ara leylətül-isra görünür.

Qəddi-tubasına şimşad olub xar, xəcil,
Bu nə qamətdi, qiyamətdi, hüveyda görünür.

Abi-heyvandı ləbi, nöqteyi-məhumdu kim
Kəşfi müşküldü məgər, belə müəmma görünür?

**FƏRD**

Yenə nə olubdu cahan cümlə Neynəva görünür?
Batıbdı yasa, hamı matəmü əza görünür.

Leyk naləndi onun gül üzünə şam-səhər,
Sevgili Fatiməsi bülbüli-şeyda görünür.

**FƏRD**

Əza tutubdu məlayik bu qissədən yeksər,
Olubdu qərq-qəmə, cümlə masəva görünür.

Əl-ayağı niyə olmuş belə qan ilə xizab,
Tazə damad olub, dəsti mühənna görünür.

**FƏRD**

Olubdu qanına qəltan cavan Əliəkbər,
Solubdu gül kimi, Əsğər bu macəra görünür.

Şahi-dinə nəzər et, Kərbübəlada guya,
Vadiyi-imənara həzrəti-Musa görünür.

### FƏRD

Köməkləri qırılıb, qalmayıbdı dadrəsi,
Bu qəmli mə'rikədə şahi-Neynəva görünür.

### FƏRD

Ləşkəri-Şam içində o şəhi-Kövnü məkan,
Əhli-Tovratın içində necə İsa görünür.

### FƏRD

Əli belində gəzir nə'şlər arasında,
Şəhənşəhi-düsəra Mir hələta görünür.

Kaf, ha Kərbübəla, qətli-Hüseyn, ya Yəzid,
Eyni-ətəş, sad onun səbrinə ima görünür.

### FƏRD

Bu qəmdə qara geyib Ənbiya bu gün yeksər,
Əgər bəsirətin olsa səva-səva görünür.

Kərbəlayə nəzər et aləmi-mə'nada bu gün,
Həzrəti-xətmi-rəsəl Seyyidi-bətha görünür.

### FƏRD

Çəkər fəğan, cəfa Zeynəbi-ələmpərvər,
O dəşti-qəmdə yenə şuri-vaəxa görünür.

Dəşti-iməndə düşübdür şühədalar bədəni,
Xak, xun içrə gülü, sünbülü rə'na görünür.

### FƏRD

Düşübdü sərv kimi xakə nə'şi-Abbasın,
İki qolu bədənindən onun cüda görünür.



Bağlayıb su yolunu Kufənin əhli yeksər,
Əlstəş naləsi bu dəştdə peyda görünür.

### FƏRD

Əsib səmumi-cəfa, gülləri solub yeksər,
Sədası bülbüli-zarın yenə nəva görünür.

Şurla naleyi-Nəvvab salıb aləmə şur,
Bu nə şurişdi, məgər məhşəri-Kübra görünür?

### FƏRD

Təğafül etmə bu dərgahdan əya Nəvvab,
Bu dərdə cümlə kəsin, dərdinə dəva görünür.

## CƏNABİ NƏVVABIN MƏZLUM HƏZRƏTİ-HÜSEYNƏ YAZDIĞI NÖVHƏ

Ey şəhi-Kərbübəla, sibti-Rəsulüs-səqleyn,
Seyyidi-əhli-cinan, şöhreyi-əhli-hərəmeyn.

Ey qalan Kərbübəla dəştiara zari-vəhid,
Yarü ənsarını öldürdülər bu qövmi-ənid.
*Ah o dəmdən ki, səni Şümri-şərir etdi şəhid*,
Ey şəhi-Kərbübəla, sibti-Rəsulüs-səqleyn,
Seyyidi-əhli-cinan, şöhreyi-əhli-hərəmeyn.

Niyə bu aləmi-imkan o zaman tutdu qərar?
Ay ilə gün tutulub, nuru gedib olmadı tar.
Yağmadı qövmi-şərir üstünə ol dəmdə şərar,
Ey şəhi-Kərbübəla, sibti-Rəsulüs-səqleyn,
Seyyidi-əhli-cinan, şöhreyi-əhli-hərəmeyn.

Tar-mar olmadı ol vaxtda bu çərxi-kühən,
Eylədi Zeynəbi *müstəqriği*-ənduhü məhən.

Yeddi qardaşına geydirdi o biçarə kəfən,
Ey şəhi-Kərbübəla, sibti-Rəsulüs-səqleyn,
Seyyidi-əhli-cinan, şöhreyi-əhli-hərəmeyn.

Kəsdi Abbasın iki qollarını qövmi-dəğa,
Növcavan Əkbəri qətl eylədilər vaəsfa!
Qasimi doğradı bu qövmi-dəni, vaveyla!
Ey şəhi-Kərbübəla, sibti-Rəsulüs-səqleyn!
Seyyidi-əhli-cinan, şöhreyi-əhli-hərəmeyn.

Ah o dəmdən ki, Əliəsğərin o gül bədənin,
Qana əlvan elədi zülmlə bu qövmi-lə'in,
Qalmadı Kərbübəla içrə sənə bircə müin,
Ey şəhi-Kərbübəla, sibti-Rəsulüs-səqleyn,
Seyyidi-əhli-cinan, şöhreyi-əhli-hərəmeyn.

O Fərati ki içərdi suyunu teyri-hava,
Əhli-beytin üzünə bağladı çün Şümri-dəğa,
Əlotəş naləsi saldı bu cahan içrə nəva,
Ey şəhi-Kərbübəla, sibti-Rəsulüs-səqleyn,
Seyyidi-əhli-cinan, şöhreyi-əhli hərəmeyn.

Sənə Nəvvab olub şamü səhər növhəsəra,
Əbri-nisan kimi hər ləhzə tökər əşki-əza,
Et şəfaət kərəm ilə sən ona ruzi-cəza,
Ey şəhi-Kərbübəla, sibti-Rəsulüs-səqleyn,
Seyyidi-əhli-cinan, şöhreyi-əhli-hərəmeyn.

## ALİ-ƏTHAR MÜSİBƏTLƏRİ BARƏDƏ CƏNAB NƏVVABIN ÇARPARƏ NÖVHƏSİ

Şahi-şəhid ətşan,
Kərbübəlada yaran,
Düşmüş yer üstə üryan,
Xak ilə xunə qəltan.



Cismi-şərifi yarə,
Əndami-pakı parə,
Yüz min şəği süvarə,
Bir xəstəvü pərişan.

Yox kimsə qəmgüsarı,
Nə munisü, nə yarı,
Zəxmi-bədəndə karı,
Əhli-əyalı giryan.

Ə'za sinanü xəncər,
Qəlbində zəxmi-Əkbər,
Abbasü Ovnü Cə'fər,
Olmuş yerilə yeksan.

Qana batanda Əkbər,
Ol Qasimi-hünərvər,
Peykan əməndə Əsğər,
Qana dönəydi dövran.

Rə'na qəddini şahin,
Əncümsifət o mahın,
Göz açdı zəxmi, dörd min,
Halına oldu giryan.

Olmadı bir müsəlman,
Olsun o şaha nalan,
Nəvvab edər başü can,
Ol kəmsüpahə qurban.

* * *

Ey boyanan qanına əlvan Hüseyn,
Haqq yoluna qoç kimi qurban Hüseyn.

Vay Hüseyn, va Hüseyn!
Ey şəhi-kövni-məkan,
Seyyidi-əhli-cinan,

Sərvəri-qüddusiyan,
Ümmətə qurban olan.

Dəşti-bəlada sənə ey şahi-din,
Olmadı bir kimsənə olsun müin,
Qövmi-dəğa çəkdilə şəmşiri-kin,
Eylədilər qanına qəltan, Hüseyn.

Vay Hüseyn, va Hüseyn!
Ey məhi-leylüd-düca,
Nuri-rüxi vəzzüha,
Şəmsi-şümusi-səma,
Şafeyi-yövmül-cəza.

Əhdi-Ələstinə çü etdin vəfa,
Mənzilini eylədin Kərbübəla.
Bağladı ətfalını Şümri-dəğa,
Su yolunu, etdilə nalan Hüseyn.

Vay Hüseyn, va Hüseyn!
Şahidi-bəzmi-qədəm,
Eşqdə sabitqədəm.
İsiyi-fəyyazdəm,
Dərgəhi-kani-kərəm.

Kim görüb aləmdə bu zülmü əyan?
– Kim yaxa damad əl-ayağına qan?
Zibh oluna qoç kimi yetmiş cavan,
Qala köməksiz şəhi-ətşan Hüseyn.

Vay Hüseyn, va Hüseyn!
Mühəzzini-əsrari-həqq,
Aşiqi-rəbbül-fələq.
Qürbi-həqqə masəbəq,
Nuri-rüximasəbəq.

Düşdü qolu təndən ələmdarının,
Batdı qana Əkbəri innabgün.
Öldü ələmdar, ələm oldu nigün,
Qaldı qoşunsuz şəhi-dövran Hüseyn.



Vay Hüseyn, va Hüseyn!
Ey məhi-bürci-hünər!
Qame'i-qövmi-kəfər,
Mahiyi-əşrari-şər,
Varisi-xeyrül-bəşər.

Düşdü çü atdan o şəhi-kainat,
Qaldı qəza şeşdəri-heyrətdə mat,
Kaş o dəm qana dönəydi Fərat,
İtrəti-əthari ləbətşan, Hüseyn.

Vay Hüseyn, va Hüseyn!
Ey güli-Xeyrənnisa,
Mərdüməki-Mustafa,
Mə'niyi-qul innəma,
Sirri-süvəri-kaf, ha.

Qaldı çü qum üstə imami-zaman,
Geydi qara əyninə huri-cinan.
Müztərib ol dəmdə zəmanü məkan,
Oldu çü öz qanına qəltan Hüseyn.

Vay Hüseyn, va Hüseyn!
Anın zibhi-əzim,
Əhdin, əhdi-qədim,
Lütfün lütfi-əmim,
Ruhi-Rəsuli-kərim.

Hüznlə Nəvvab şəha, Xosrova,
Növhələr eylər sənə şamü səba.
Yoxdur ümidi kərəmindən səva,
Qoyma onu həşrdə nalan, Hüseyn.

Vay Hüseyn, va Hüseyn!
Yoxdu pənahı onun,
Çoxdu günahı onun,
Qoyma qala qəlbi xun,
Həşrdə zarü zəbun.

## ƏBÜLFƏZL-ABBAS NÖVHƏSİ

Ey verən canını cananına qurban Abbas,
Haqq yolunda bulaşan qanına qəltan Abbas.

Yoxdu həmta sənə dünyada əya radi-güzin,
Nə şücaətdə, rəşadətdə, məhabətdə yəqin.
Heydəri-sanisən ey həbləri həblülmətin,
Büğzünüz nayireyi-atəşi-nəyran Abbas.

Əşcəyi-nassan ey şiri-jiyan, bəbri-dəlir,
Şiri-gərdun dəm tiğində olur rübəhi-pir.
Gərçi amadə olub qəsdinə min xəncərü tir,
Gətirib Şümrü sinan qətlinə fərman Abbas.

Eylədin cani-əzizini çü cananə fəda,
Aləmin canı fəda canına ey kani-səxa.
Qaldı yalqız o biyabanda çü şahi-şühəda,
Olmadı aləmi-imkan niyə viran Abbas.

Hicrinə Zeynəbi-Gülsüm çü oldula düçar,
Vaəxa nalələri saldı cahan içrə şərar,
Bülbülü qümri bisməl kimi hər biri fikar,
Qəddi-şimşadinə olmuşla əzaxan Abbas.

Şaxeyi-gül təki etdilə çü bazunu qələm,
Gülşəni-din pozulub, rövnəqdən düşdü o dəm.
Şahi-dinin qədi-sərvini bu qəm eylədi xəm,
Suzi-ahı edib aləmləri büryan Abbas.

Ələtəş nalələri tifllərin aldı qərar,
Aləmi-kövnü fəsadə salıb ol naleyi-şərar.
Bax bəsirətlə ki, ol dəştdə var naləvü zar,
Yenə məhsus olur kim ona ətşan, Abbas.

Naleyi-Möhsini-Nəvvab salır aləmə şur,
Vahüseyn şuru nümayan edir şuri-nəşur,
Şuri-matəmdi bu şivən səsi ya nəfxeyi-sur,
Ya edir cinnü mələk naləvü əfğan, Abbas.



## NƏVVABIN 1285 (1868)-ci İL AŞURA GÜNÜNDƏ YAZDIĞI NÖVHƏ

Gözlərim, ağlagilən şahi-şəhidanə bu gün
Ki, düşüb Ali-Nəbi kəştisi tufanə bu gün.

Gülşəni-din pozulub, gülləri yeksər dağılıb,
Neynəva dəşti dönüb rövzeyi-rizvanə bu gün.

Gül təki qanə bulanmış şühədalar bədəni,
Sərvi-tuba kimi düşmüş hərə bir yanə bu gün.

Qəddi-rə'nası Əliəkbəri xunin kəfənin,
Ərğəvan kimi boyanmış necə al-qanə bu gün.

Qönçeyi-gül tək ətəşdən Əliəsğər saralıb,
Ali-ətharı yaxıb atəşi-hicranə bu gün.

Zeynəbi-bikəsi-zarın, o şəği Şümrü sinan,
Yetirib naləvü fəğanını Keyvanə bu gün.

Bağlayıb su yolunu Kufənin əhli yeksər,
Şö'leyi-zülm salıb aləmi-imkanə bu gün.

Şümri-dun ləşgərilə qarət edib xeymələri,
Odlayıb, nalə çıxıb dərgəhi-Sübhanə bu gün.

Məxzəni-elmi-Xudavənd cahanı dağıdıb,
Çəkməli çünki çıxıb sineyi-süzanə bu gün.

Mustafa busəgəhinə qoyub o xəncəri-kin,
Ah-əfqanı salıb zümreyi-insanə bu gün.

Ah-zarı dayanıb ərşə bu gün Nəvvabın,
Naləsi eylər əsər kühü biyabanə bu gün.

## CƏNABİ-NƏVVABIN MƏZLUM ƏHLİ-BEYTİ-ƏTHARA YAZDIĞI NÖVHƏ

Düşdü atdan yerə çün şahi-şəhidan yaralı,
Bədəni-pakı onun nizəvü peykan yaralı.

Guya düşdü yerə ərşi-Xudavəndi-mübin,
Çərxi-çarümdə vurub başına Cəbrayili-əmin.

Nеçə sərkərdə şəhid etmək üçün etdi kəmin,
Ta ki, zibh eləyələr başını daldan yaralı.

Yeddi zərbətlə kəsib başını Şümr ilə Sinan,
Saldıla şur-noşur aləmi-imkanə əyan.

Od tutub yandı, alışdı o qəmə cümlə cəhan,
Fərqi-ənvarı edib nizədə çövlan yaralı.

### FƏRD

Çün Zülcinahdan şəhi-ətşanı yıxdılar,
Dövran dolandı, çün şəhi-dövranı yıxdılar,
Guya yer üzrə günbədi-xəzranı yıxdılar,
Səhv eylədim ki, ərşi-müəllanı yıxdılar.

Tirə-tar oldu fələk, yellər əsib, gün qaralıb,
Zəlzələ etdi cahan, vəlvələ dünyayə salıb.
Mehrü məh şeşdəri-heyrətdə o dəm mat qalıb,
Xak, xun içrə düşəndə şəhi-dövran yaralı.

Qətlgah içrə o dəm Zeynəbi-biçarə gəzər,
Qətlgahın tozunu, torpağını başə səpər.
Axtarır qardaşının nə'şi-şərifindən əsər,
Bir çuxur yerdə tapıb qanına qəltan yaralı.



### FƏRD

Hökm etdi İbn Sə'd, o dəm ləşgəri-dəğa,
Şümrü Sinanü Xuliyi-qəddar, bihəya.
Üz qoydu xeyməgahə tərəf əz rəhi-cəfa,
Xüld içrə xaneyi-dili-Zəhranı yıxdılar.

Növərusun güli-rə'na kimi rəngi sar olub,
Qasimin hicri-rüxunda əli qoynunda qalıb.
Əkbərin sərvi-qədi qanına qəltan olub,
Kim görüb cənnətara sərvi-xuraman yaralı.

Gülşəni-din pozulub, gülləri tarac olub,
Bülbülün nalə səsi şur gülüstanə salıb.
Gül kimi ali-Nəbi cümləsi pəjmürdə qalıb,
Cövri-xar ilə düşüb sünbül, reyhan yaralı.

### FƏRD

Şam əhli yada salmadı bir ruz məhşəri,
Etdi şəhid Qasimü Abbasü Əkbəri.
Bülbül sədası, qümruyi-zarın nəvaları,
Düşdü cahanə sərvi-xüramanı yıxdılar.

Ənbiya yasa batıb, tutdu əzasını Xəlil,
Hacər ağlayıb, bu qəmə qara geyib İsmayıl.
Şah biyarə olub, mərsiyəxan Cəbrayıl,
Növhə eylər hamısı, vay yaralı, can yaralı.

Ah o dəmdən ki, şəği Kufənin əhli o zaman,
Etdilər şahi-şəhid itrətini Şamə rəvan.
Vay o gündən ki, qədəm həşrə qoya şahi-cahan,
Başı əldə, cəsədi tiğ ilə peykan yaralı.

FƏRD

Çün Şam səmtinə çəkilib o zaman qatar,
Şurü fəğan ah salıb aləmə şərər,
Qan içrə qaldı cismi-şəhənşahi-tacdar,
Nəvvabi-zar başına dünyanı yıxdılar.

Kərbəla dəşti dönüb səhni-gülüstanə o gün,
Şühədalar bədəni laleyi-Ne'manə o gün.
Ərğəvan kimi boyanmış hamı al-qana o gün,
Qumlar üstündə qalıb cümləsi üryan yaralı.

Bu vəqaye'dən olub qəddi kaman Nəvvabın,
Gözünə tirəvü tar oldu cahan Nəvvabın.
Xaməsi yandı, alışdı o zaman Nəvvabın,
Od tutub, yandı bu qəmdən dili-suzan yaralı.

## CƏNABİ-NƏVVABIN ZEYNƏB XANIMIN DİLİNDƏN YAZDIĞI NÖVHƏ

Qardaş, bu meydanda düşənlər sənin olsun,
Al-qanına gül tək bulaşanlar sənin olsun.

Məhbubi-həqiqi yoluna can verənlər,
Dəryayi-şəhadətdə şinavərlik edənlər,
Gülgün kəfənü gül bədənü qönçə dəhənlər,
Qana boyanan zülfü səmənlər sənin olsun.
Qardaş, bu meydanda düşənlər sənin olsun,
Al-qanına gül tək bulaşanlar sənin olsun.

Zülmə çü düçar etdi fələk ali-əbanı,
Zülm ilə biyabanə çəkirlər üsəranı.
Sən saxlagilən yetmiş iki tən şühədanı,
Qırx sinəsi büryan qara mə'cər mənim olsun.
Qardaş, bu meydanda düşənlər sənin olsun,
Al-qanına gül tək bulaşanlar sənin olsun.



Bir dəstə ətəşdən, saralan hicrdə nalan,
Bu xeyl hərəmlər ki, olub zinəti talan,
Bu xırda uşaqlar ki, edər naləvü əfğan,
Biyarü mədədkar qalanlar, mənim olsun.
Qardaş, bu meydanda düşənlər sənin olsun,
Al-qanına gül tək bulaşanlar sənin olsun.

Şamə çü çəkərlər bizi bu qövmi-şəqavət,
Şamilər ederlər bizə zülmlə şəmatət,
Sən eləgilən nizədə Qur'an təlavət,
Hudəcdə yanan sineyi-sinan, sər mənim olsun.
Qardaş, bu meydanda düşənlər sənin olsun,
Al-qanına gül tək bulaşanlar sənin olsun.

Suz ilə vuran sinəsinə, ah çəkənlər,
Şur ilə münacat edib, növhə edənlər,
Neysan kimi göz yaşını hər ləhzə tökənlər,
Şövq ilə Hüseyn vay çəkənlər, sənin olsun.
Qardaş, bu meydanda düşənlər sənin olsun,
Al-qanına gül tək bulaşanlar sənin olsun.

Qumri kimi Nəvvab çəkər naleyi-gugu,
Neysan kimi qan-yaş axıdıb axtarır hər su,
Məqsudunu hər dəm çağırı naleyi-ya hu,
Məcnun kimi səhrayə düşənlər, mənim olsun.
Qardaş, bu meydanda düşənlər sənin olsun,
Al-qanına gül tək bulaşanlar sənin olsun.

## NƏVVABIN ƏBU ABDULLA HÜSEYN (Ə.) MÜSİBƏTİNƏ YAZDIĞI NÖVHƏ

Yaran, bu necə zülmdü dövran arasında,
Ətşan şəhi-dövran qala meydan arasında.
Ya şahi-vilayət, ya saqiyi-kövsər,
Yoxdur Əliəkbər, Abbasi-hünərvər, ta kim ola yavər.

Gül tək saralıb tifillərin arizi-alı,
Nə təndə qalıb qüvvəti, nə dildə qərarı.
Gülsümün əlif qaməti qəmdəndi hilalı,
Bülbül təki pejmürdə şəhin'alü əyalı.
Ya şahi-vilayət, yox bircə nəfər yar,
Bir munisü qəmxar, nə yar, nə ənsar, min milləti-əşrar.

Bu qövmə baxın kim şəhi-mərdanə inanmaz,
Nə bil ki, yəqin qadiri-sübhanə inanmaz.
Qur'an oxuyur, natiqi-Qur'anə inanmaz,
Nə bil ki, yəqin qadiri-sübhanə inanmaz.
Ya şahi-vilayət, ey seyyidi-aləm, mövlayi-mükərrəm,
Şahənşahi-əkrəm, həqq sirrinə məhrəm.

Yüz min səgi-qəddar alıb cümlə arayə,
Bir yaralı ahuni ki, salsınlar bəlayə,
Əfğanı çıxıb tifillərin ərşi-xüdayə,
Su vermədilər sən kimi qurban, vəfayə.
Ya şahi-vilayət, ey mənbəyi-ehsan, ey qateyi-bürhan'
Güri-şahi-şəhidan, məzbuh olur ətşan.

Ey Qasimi-nəyranü cinan, baisi-imkan,
Bir elə əyalına nəzər, ba dili-büryan.
Ətşan ləbi büryan, hərasanü ciyər qan,
Bikəs yaralı, yavəri yox, yavəri-dövran.
Ya şahi-vilayət, qıl bircə nəzarə,
Bu ah, bu zarə, bimünisü yarə, məcruhi-fikarə.

Nəvvab, keçir nalə ilə leylü nəharı,
Biyarü mədədkarə ki, ölmüş hamı yarı.
Bu möhnəti-üzmada nə səbri, nə qərarı,
Sən eylə mədəd həşrdə, ey ciddi-kübarı.
Ya şahi-vilayət, sən eylə şəfaət,
Qoyma qala xiclət, ey mə'dəni-rəhmət, et daxili-cənnət.



## SƏKİNƏ XATUNUN DİLİNDƏN

Əli Əkbəri qan içrə doğranan, baba vay,
Əli Əsğəri zülmilə oxlanan, baba vay.

Uşaqları dağılan çöllərə, biyabanə,
Tamam xeyməvü xərgahı odlanan, baba vay.

Düşən qum üstünə, al qanına olan qəltan,
O gül kimi bədəni oxlara nişan, baba vay.

Hanı əmilərim, Allah, nə eyləyim çarə,
Əsir edir məni bu Şümür ilə Sinan, baba vay.

Ola bu canına qurban Səkineyi-nalan,
Yetişgilən dadıma, neyləyim aman, baba vay.

Şəfaət eyləgilən məhşər içrə Nəvvabə,
Gecə-gündüz eşidər ahi-əlaman, baba vay.

## NÖVHƏ

Ah o vaxtdan əzmi-xeyməgah Şümüri-mə'luni-əbtər eylədi,
Ah o zülmdən ali-əthara kinilə qövmi-kafər eylədi.

Xeyməgəhi çün etdilər talanır, ərşi-ə'laya çıxdı əlaman,
Bir belə zülmü kim görüb, yaran, Zeynəbə ol dəm ləşkər eylədi.

Yarü ənsarı qanına qəltan, yeddi qardaşı xakilə yeksan,
Ah o vaxtdan azimi-meydan Əkbəri şahi-ənvər eylədi.

Aləmə düşdü əlatəş səsi, yandı dünyanın xarü xarəsi,
Ah vaveyla, şahi-bikəsi binəva çərxi-əxzər eylədi.

Ahü zarindən ali-əthanın tirətar oldu dəşti-Kərbəla,
Od tutub guya cümlə masiva zülmünü gərdun əzhər eylədi.

Bir zamanədə bir Yəzid olur, zülmlər eylər ali-əthara,
Bu zəmanənin beş Yəzidi var, zülm Nəvvabə bədtər eylədi.

## HƏZRƏT HÜSEYN ƏLEYHÜSSƏLAMA NÖVHƏ

Ya Əliyyül mürtəza,
Qum fəqəd zaqəlfəza.
Çün şəhidi-Kərbəla düşdü atdan guya,
Gəldi göylərdən səda: Ya Əliyyül mürtəza.
Ya Əliyyül mürtəza,
Qum fəqəd zaqəlfəza.
Titrəyib ərşi-bərin, zəlzələ etdi zəmin,
Qana qəltan şahidin, ya Əliyyül mürtəza.

### FƏRD

Qəmim biyarlıqdan etdi tüğyan,
Yetirsin Əkbərü Abbası, yarəb.
Əritdi cismü canım nari-hicran,
Yetirsin Əkbərü Abbası, yarəb.

Ya əmirülmö'minin, ya imam ül-müttəqin,
Ya şəfiülmüznibin, ya Əliyyül mürtəza.
Ya Əliyyül mürtəza,
Qum fəqəd zaqəlfəza.

Şümrü qəddarü pəlid,
Oğlunu etdi şəhid,
Dərdü qəm oldu məzid,
Ya Əliyyül mürtəza,
Ya Əliyyül mürtəza,
Qum fəqəd zaqəddəlfəza.

### FƏRD

Məni salmış bəlayi-nagəhanə,
Üzün ünqa kimi çəkmiş nihanə,
Gəlibdir Fatimə şurü fəğanə,
Yetirsin Əkbərü Abbası, yarəb.



Qanə batdı Əkbəri, Qasimi-gülpeykəri,
Soldu gül tək Əsğəri, ya Əliyyül mürtəza,
Ya Əliyyül mürtəza,
Qum fəqəd zaqəlfəza.
Nofəli-bidadi-din saldı Abbasın qolun,
Kəsdi ümidin onun, ya Əliyyül mürtəza,
Ya Əliyyül mürtəza,
Qum fəqəd zaqəlfəza.

### FƏRD

Yezidi-rusiyəh itsin cahandan,
Babam bizar oldu xanimandan,
Ayırdı cismi-zarı pak candan,
Yetirsin Əkbərü Abbası, yarəb.

Abidin bikəs qalıb, xeyməgahı odlanıb,
Aləmi əfğan alıb, ya Əliyyül mürtəza.
Ya Əliyyül mürtəza,
Qum fəqəd zaqəlfəza.
Şümüri-dun etdi əsir, əhli-beyti dəstgir,
Qaldılar zarü əbir, ya Əliyyül mürtəza,
Ya Əliyyül mürtəza,
Qum fəqəd zaqəlfəza.

### FƏRD

Səba, gəl bir güzər qıl neynəvayə,
Söylə halımı şahi-Kərbəlayə,
Məgər rəhm eyləməzlər binəvayə?
Yetirsin Əkbərü Abbası, yarəb.
Eyləyir Nəvvabi-zar növhəyi-qəmi-aşikar,
Qəlbi qəmdən od tutar, ya Əliyyül mürtəza,
Ya Əliyyül mürtəza,
Qum fəqəd zaqəlfəza.

## NÖVHƏ

Ey fələk, ol nöhrivaqın tarü mar olsun sənin,
Pərveriş verdin neçün ali-peyğəmbər qanlısın.

Şafe'i-ruzi-cəzadan etmədin heç bir həya,
Heydərin qanına etdin təşnə, Heydər qanlısın.

Ey fələk, şad eylədin ali ziyadı, şərm qıl,
Kamiyab etdin cahanda ali-əthar qanlısın.

Əkbərin rə'na qədin qan içrə qəltan eylədin,
Qılmadın sən bir həya, şad etdin Əsğər qanlısın.

Qoymadın kamın ala ol Qasimi-no kədxuda,
Şadkam etdin necə bir belə sərvər qanlısın.

Gəlmişik meydanə biz bu baş, bu tiği-xunfəşan,
Ya ölək, ya öldürək ali-peyəmbər qanlısın.

Qət edək ali-ziyadın nəslini aləmdə biz,
Parə-parə eyləyək övladi-Heydər qanlısın.

Olmadıq, vahəsrəta, Kərbübəlada ta edək,
Xəncəri-bürranilə sədparə Əkbər qanlısın.

Geymişik qanlı kəfənlər, baş-candan keçmişik,
Ya ölək, ya öldürək növrəs cavanlar qanlısın.

Olmadıq ol dəmdə çün bu tiği-xun aşanilən,
Öldürəydik ta ki, Abbas dilavər qanlısın.

İmdi lazımdır cahanı qana əlvan eyləyək,
Qanına qəltan edək Ovnilə Cə'fər qanlısın.

Ey Yəzidi-bihəya üzrün nədir ruzi-cəza,
Təşnəkam Kərbəla ol dəm ki, istər qanlısın.

Vay o gündən kim, təzəllüm eyləyib xeyrünnisa,
Kibriyadan istəyə övladi-əthər qanlısın.



Zeynəbin başında parə-parə şahın köynəgi,
Axtara qan yaşlı ol dəm şahi-bisər qanlısın.

Əldə Gülsümün ələmdarın qolu dadə gəlib,
Dadgərdən istəyə Abbasi-sərvər qanlısın.

Məhşər içrə məhşəri-kübra edə leyla o gün,
İstəyə əfğanilən şahzadə Əkbər qanlısın.

Ləşkəri-şahi-cahanın əldə qanlı sərləri,
İstəyə qəhhardan hər biri kafər qanlısın.

Qərq edər göz yaşına Nəvvab əhli-məhşəri,
Dadgər nara salıncan cəddi-əthər qanlısın.

Kaş olaydı Kərbəlada, ta edəydi cannisar,
Şiələrlə qətl edəydi şahi-ənvər qanlısın.

## MƏHƏMMƏDAĞA MÜCTƏHİDZADƏ QARABAĞİNİN (MÜŞTƏRİ) NÖVHƏSİ

Dur gedək, yatma quru yerdə mələkmənzər oğul,
Ey Əliəkbər oğul, şibhi-Peyğəmbər oğul.
Gözləyir qanlı göz ilə yolunu mədər, oğul,
Ey Əliəkbər oğul, şibhi-Peyğəmbər oğul.

Ol rəvan xeyməyə, rəhm eylə anan Leylayə,
Qoyma divanə olub üz çevirə səhraye.
Bidi-məcnun kimi həm lərzən düşə ə'zayə,
Qeydi-zülfün anı Şamə çəkə bimə'cər, oğul.
Ey Əliəkbər oğul, şibhi-Peyğəmbər oğul.

Leyli-Leylanı münəvvər edən ey mahi-münir,
Şövqi-ruyin edib ol bikəsi pabəndi-əsir.
Az qalıb payinə zülfün vura möhkəm zəncir,
Tökülüb şəmsifət başına xakistər, oğul.
Ey Əliəkbər oğul, şibhi-Peyğəmbər, oğul.

## ƏFRAD

Ayağa dur gedək, ey sərvqəd, gülpeykər,
Ki, gözləyir yolun əhli-əyali-Peyğəmbər.

Biri deyir nə üçün tərki-xaniman etdin?
Fəda olum sənə ey növcavan Əliəkbər.

Biri deyir necə sənsiz rəvan olum Şamə?
Ki, şamsız keçirim Şam içrə şam-səhər?

Biri deyir dəxi su istəsəm kəsin dilimi,
Susuzdu, yoxsa ki, gəlmir o şahi-təşnəciyər.

## NÖVHƏ

Seydi-səyyadi-qəza, qeydkeşi-əhli-hərəm,
Ahuyi-dəşti-bəla, qəryeyi-peykani-ələm.
Dur gedək ta ki, anan zəxminə qoysun mərhəm
Ki, kəmingəhdə durub qətlinə min ləşgər, oğul.
Ey Əliəkbər oğul, şibhi-Peyğəmbər, oğul.

Xeymə olubdur o Züleyxavəşə zindan sənsiz,
Daməni-gül edib, çak giriban sənsiz.
Misli-Yə'qub qurub gülbeyi-əhzan sənsiz,
Ey əzizim mənim, ey Yusifi-gülpeykər, oğul,
Ey Əliəkbər oğul, şibhi-Peyğəmbər, oğul.

Tökülüb möhnət qəm üstümə Əyyub kimi,
Səbrsizlikdən vurar əl başə Yə'qub kimi.
Qara zülfi ağarıb dideyi-Yə'qub kimi,
Çahi-möhnətdə qalıb Yusifi-qəmpərvər, oğul,
Ey Əliəkbər oğul, şibhi-Peyğəmbər, oğul.



## ƏFRAD

Yoxundu taqət əgər durmağa səni Tanrı,
Əlini ver əlimə, dur çağırma sərdarı.

Əzizi-mən, mütəəzzizdi çünki zülm ilə,
Ədu salıbdı yerə qolsuz ol ələmdarı.

Müavinət tələb etmə bu dəmdə bir kəsdən,
Şəhadətə yetiriblər neçünki ənsarı.

Gərəkdi kim, səni mən şimdi xeyməyə aparım,
Ki, intizaridə qoymaq olurmu bimarı?

## NÖVHƏ

Qorxuram gül bədənin qan ilə əlvan edələr,
Şəqqalər könlünü həm qönçəsifət qan edələr.
Soyalar pirhənin tiğ tək üryan edələr,
Qoyalar həncəri-pakinə sənin xəncər, oğul.
Ey Əliəkbər oğul, şibhi-Peyğəmbər, oğul.

Nə rəva xaki-məzəllətdə qala gül bədənin,
Düşə xürşidsifət torpağə vəchülhəsənin,
İsti qumlar ola bu dəştdə qətnülkəfənin,
Paymal eləyələr cismini siminbər, oğul.
Ey Əliəkbər oğul, şibhi-Peyğəmbər, oğul.

Yox üzüm xeyməyə sənsiz gedim, ey sərvi-rəvan,
Dur rəvan ol mənlə, cisminə canım qurban.
Sakit et ənmələrin, bacını qoyma giryan,
Ki, həlak etdi özün xeymədə ol müztər, oğul.
Ey Əliəkbər oğul, şibhi-Peyğəmbər, oğul.

## ƏFRAD

Ayağa dur gedək ey növnəhali-Peyğəmbər,
Ki, qoyma tərki-həyat eləyim məni-müztər.

Neçə baharıdır ömrün ki, tez xəzan oldu,
Beğeyri-əşki-bəsər vermədi bir özgə səmər.

Nə növ növgül idin kim, açılmamış soldun?
Misali-qönçə yedirtdin anana xuni-ciyər?

Nə mah idin ki, tulu' etməmiş qurub etdin,
Az oldu ömri-əzizin misali-nəcmi-səhər.

## NÖVHƏ

Kim səni saldı bu halə mənim ey taci-sərim?
Qoydu torpağa gün kimi nuri-bəsərim.
Qıldı münşəq qəmərim tiğ ilə nəcmi-səhərim,
Ömrünün şəm'ini kim söndürdü məhmənzər, oğul?
Ey Əliəkbər oğul, şibhi-Peyğəmbər, oğul.

Hansı birəhm sənin qətlinə verdi fərman?
Ömrünün tazə baharın eylədi böylə xəzan?
Sünbüli-tər kimi hər yanına vurdu peykan,
Nəxli-qədin qoparıb saldı yerə, sərvər, oğul.
Ey Əliəkbər oğul, şibhi-Peyğəmbər, oğul.

Nərgisin aç mənə sarı, bax o şəhla gözünə,
Baxubən əşk töküm laləsifət gül üzünə.
Qıl təkəllüm mənlə qurban o şirin sözünə,
Dil-canım mənim, ey bikəsü biyavər, oğul.
Ey Əliəkbər oğul, şibhi-Peyğəmbər, oğul.



## ƏFRAD

Budur xəyalım əgər kim, məni ixtiyar edəsən,
Əziz Fatiməyə nəğdi-can nisar edəsən.

Bu dəştdə məni fərdi-vəhid qoymayasan,
Vəfanı cümleyi-afağə aşikar edəsən.

Həmişə mərqədi-pakın ola kənarımda,
Mənim yolumda vücudunu tar-mar edəsən.

Əziz əmmələrin əlvida' etmək üçün,
Mənlə xeyməyə lazımdı kim, güzar edəsən.

## NÖVHƏ

Ey əzadar Hüseyn, nalə edin sübhü məsa,
Bir mələkmənzər kim, cəddəsidir Xeyrünnisa,
Yetişir dadınıza şafeyi-ruzi-cəza,
O zaman kim, çəkər ağuşə deyər bisər, oğul.
Ey Əliəkbər oğul, şibhi-Peyğəmbər, oğul.

Müştəri, müştərisən cənnəti-tubayə əgər,
Çeşmeyi-çeşmi axıt bəzmara çün kövsər.
Səni biəcr eyləməz padşahi-təşnəciyər,
Yetər imdadına cəddü pədərü madər, oğul.
Ey Əliəkbər oğul, şibhi-Peyğəmbər, oğul.

## MİRİBRAHİMİN NÖVHƏSİ

Düşəndə şahidin yerə, o dəmdə göylər ağladı,
Cahan gəlib təzəlzülə, tamam yerlər ağladı.

Qara yel əsdi ol zaman, cahana düşdü əlfəğan,
Təğyir eylədi zaman, Nəcəfdə Heydər ağladı.

Tökərdi Zəmzəm əşki-qəm, qara geyindi Kə'bə həm,
Dağıldı həllül-hərəm, Mənavü məş'ər ağladı.

FƏRD

Yenə nə olubdur çəkərlər bu növ şur, nəva?
Qarayə, yasa batıblar, olubla növhəsəra.

NÖVHƏ

Batıbdı yasa, masəva düşəndə şahi-Neynəva,
Qiyamət oldu, guya o halə kafir ağladı.

Çü çəkdi Şümr xəncərin, şəhid edə o şahidin,
İmamı çün görüb, qəmin, əlində xəncər ağladı.

FƏRD

Məgər şəhid olubdur şəhənşəhi-dövran?
Ki, aləm içrə nümayan olubdu şur-fəğan?

NÖVHƏ

Fələk görüb o sərvəri, yer üzrə tökdü əxtəri,
Qaraldı şəmsi-əzhəri, qamu fələklər ağladı.

Düşən zaman o şəhsüvar, düşəydi aləmə şərar,
Yanaydı dəhr hər nə var o dəm ki, xahər ağladı.

FƏRD

Hüseyn-Hüseyn çağırıb Zeynəbi haraya gəlib,
Salıbdı aləmə səs, gör necə nəvayə gəlib.

NÖVHƏ

Nəvayə gəldi bülbülü, şükûftə olmadı gülü,
Boyandı qana sünbülü, Əliəsğər ağladı.

Baharı oldu çün xəzan, quru yer üstə verdi can,
Tapılmayıb ona yanan, vəli şəcərlər ağladı.



FƏRD

Məgər ki, Şümr kəsibdir Hüseyn başın daldan
Ki, tirtap olubdur bu aləmi-imkan.

Küsufə düşdü aftab, edib zəmanə inqilab,
Bu zülmdən olub kabab, o mehri-xavər ağladı.

Olanda Mir növhəgər, yanar cəmi' xüşkü tər,
Yer üzrə qanlı yaş tökər ki, çərxi-əxzər ağladı.

## MİRİN NÖVHƏSİ

Ey camaat bir salın siz yada hövli-məhşəri,
Bu qədər zülm eləyib, incitməyin Peyğəmbəri.

İzzətü cahü cəlal ilə Vətəndən köçmüşəm,
Haqq yolunda yarü yavərdən təmamən keçmişəm.
Aləmi-mə'nada mən cami-şəhadət içmişəm,
Haqq yolunda vermişəm qurban Əliəkbəri.

Kəssəyiniz başımı daldan siz əgər Yəhya kimi,
Şayiqəm eşq atəşinə yanmağa Musa kimi.
Dar ayağına əgər çəksəz məni İsa kimi,
Rahi-haqda qoymuşam bu cism, bu can, səri.

Kaf, ha Kərbübəla şə'nimdə olmuş müncəli,
Cümlə əhli-cahana cəddi-pakımdır Nəbi.
Ba bismilla üçün bir nöqtədir, babam Əli,
Qüdrətüllahdır əl üstə, gətirdi babi-xəbəri,

Şə'nimizdə nazil etmiş xaliqi-ərz, səma,
İnnəmavü şərhi-zilqürəbavü şərhi-hələta,
Dürri-dəryayi-kəramət, gövhəri-bəhri-səxa,
Mustafa başına gəlmiş bu cəlalət əfsəri.

Lövhi-məhfuz içrə cari eyləmiş kilki-bəyan,
Batini-Qur'an sərasər vəsfimiz eylər əyan.
Büqzümüzdə nar nəyran, həbbimizdə həm cinan,
Tapşırıbdır katibi-Küdrət bizə bu məhzəri.

Mən gərəkdir kim bu gün vasil olam cananıma,
Razıyam yüz min yaralar gər yetişsə canıma.
Aşiqi-həqqəm, xəyalımdır batam öz qanıma,
Müntəzirdir saqiyi-rizvan, əlində kövsəri.

Mir olubdur ya Hüseyn övladına növhəsəra,
Suzi-ah ilə çəkər hər ləhzə min şurü nəva,
Hər iki dünyada lütf et dərdinə, eylə dava,
Et şəfaət rövzeyi-rizvanə, həm ol rəhbəri.

## MİRİBRAHİM AĞAMİRZADƏNİN NÖVHƏSİ

Dur ayağa bacı Zeynəb, cəyirəm olubdur parə,
Qəmü möhnətü ələmdən ölürəm, gəl eylə çarə.

Pozulur nizami-aləm, çəkilir qara səmayə,
Dağılıbdı xanımanım, dönəcəkdi Neynəvayə.
Cəm olub qamu məlayik, verəcək səda-sədayə,
Qaralıb bu şəmsi-ənvər, tökülür yerə sitarə.

Yetişibdi başa ömrüm, belə olmuşam şikəstə,
Ürəyim dönübdür qanə, necə qalmışam üz üstə.
Bu qədər müsibət, qəm məni eləyibdi xəstə,
Yetişən vüsalə aşiq dözə belə intizarə.

Bacı, rəhm eylə, dur gəl ki, gəlir anam harayə,
Qamu əhli-cənnətlə düşəcəkdi ah-vayə.
Məni belə zar görcək verəcək nəva-nəvayə,
Batacaqdı yasə yeksər, salacaqla başə qarə.

Bacı, səndən özgə yoxdur bu zaman ümidgahım,
Bu dəm ayrılıqdı, dur gəl yetişibdi ərşə ahım.



Sağ olaydı kaş cəddim, o, olaydı dadxahım,
Bu müsibəti deyəydim o şəhənşəhi-kübarə.

Bu bəlalı dərd-qəmdə belə bu bəlalı könlüm,
Necə hicrə tab qılsın, dəxi bu cəfalı könlüm.
Bu gecə məhaqə düşdü necə gör hilali könlüm,
Tutulanda mahi-taban, dəxi olmaz aşikarə.

Gedib əldən iqtidarım, dəxi qalmayıb nişanə,
Dağılıbdı gülüstanım, pozulubdu aşiyanə,
Ölürəm bacı, amandır, ciyərim dönübdü qanə,
Dur özün əlac eylə, varsa əlində çarə.

Duruban bacı nə gördü, sinə laxta-laxta qandır,
Yüzünü qoyub üzünə, dedi qardaşım amandır.
Bu nə haldır digərgün, məgər axirüzzamandır?
Dedi bacı içmişəm su, ciyərim olubdu parə.

Xəbər et bu dəmdə bacı, gələ ol vəfalı Abbas,
Necə oldu bəs Hüseynim, tutalar mənə bu gün yas.
Ölürəm, ayağa dur, sən məni bircə bağrına bas,
Qəmi-hicr əlində canım necə gör gəlibdir zarə.

Nə qədər canımda can var yazaram kitab, Zeynəb,
Bu müsibətü ələmdən olaram kabab, Zeynəb.
Buyuraydı kaş Mirə o zaman xitab, Zeynəb,
Kömək eylə canü dildən məni-bikəsü fikarə.

## HƏSƏNƏLİ AĞA XAN QARADAĞİNİN NÖVHƏSİ

Doğdu bir gün Neynəvada nilə ahın dağıdır,
Yandırır yer mahısın, göy mehrü mahın dağıdır.
Kəc durub, süzgün baxır, tiri-gahın dağıdır,
Ariz üzrə hər tərəf zülfi-siyahın dadğıdır.
Mülki-İslam içrə küffarın sipahın dağıdır.

Şama sarı üz tutub çün əhli-beyt oldu rəvan,
Tutdular başlar müqabil, çaldılar dəfü çəğan.
Söylədi Leyla o dəm va Əkbərə, etdi fəğan,
Qönçəvəş qan oldu bağrım həsrətindən hər zaman,
Sinədə bu dağlar bir kəc nigahın dağıdır.

Göz yaşım sel tək axar ta ki, üzündən qan silə,
Gün çıxıb, qarşı dura bu il görüb aləm bilə.
Bağlayıb imanını, uymaz nədən zülfü telə,
Zahidi-xüdbin müqəvvəs qaşların yadı ilə,
Səcdə qılmaz bir zaman öz səcdəgahın dağıdır.

Söylədi Leyla, səba əs, sinəmə çək dağ, döz,
At üzündən Əkbərin zülfünü görsən neçə göz.
Baxır ol xalü xətə bir dəm əyan oldu bu söz,
Ol niqab altından ər xürşid rüx göstərsə üz,
Şö'leyi-rüxsarı çərxin mehrü mahın dağıdır.

Gəl nəvayə Neynəvada bunca nalan incimə,
Ey könül, tab eyləsən bu zülmə ətşan, incimə.
Tey qıl mənzilləri üftanü xizan, incimə,
Səngdil Şümrün cəfasından sən ey can incimə.
Ah çəksən, aləmi bu tiri-ahın dağıdır.

Mətləyi-şəmsi-əzəldəndir şüayi-aftab,
Feyzi-üzəmayə səbəbdir baisi-əhli-səvab.
Gər ola bərhəm, yekrə'y Şümri-aləm bu cənab,
Dedilər kim, dostlar pəndin eşit, verdi cavab –
Rəsmdir divanə başdan nikxahın dağıdır.

Bu nə övza' nə əhval Hüseyndir, ey Xuda,
Ümmətin yolunda canü başından oldu cüda.
Canı cananın bilib cananına canın fəda,
İstima' bulmaz Qaradaği nəsihət zahida,
Ehtiraz eylə kim, ahı xanigahın dağıdır.



## HƏSƏNƏLİ AĞA XAN QARADAĞİNİN NÖVHƏSİ

Gəl ey bu cismim içrə can əmoğlu,
Sənə canım ola qurban əmoğlu.

Məni-bəxti-qarayə gör nə günlər,
Sanıb səndən sora dövran əmoğlu.

Səfayi-xatirindən pak qıldın,
Qübari-mayəkün kan əmoğlu.

Yetişdin sən bu minayi-mənayə,
Hərimi-qürb üçün qurban əmoğlu.

Mənə beytülhüzndür hiclə sənsiz,
Sərvərim, son işim əfqan, əmoğlu.

Əli qoynunda bu dəşti-bəlada,
Dolannam zarü sərgərdan əmoğlu.

Kimə dərdi-dilim izhar edim mən?
Umub dərdi-dilə dərman, əmoğlu.

Vəfasız dinməzəm mən sən vəfayə,
Vəfasızdır yə'qin dövran, əmoğlu.

Olaydım kor, səni la görməyəydim,
Bu növ qanına qəltan əmoğlu.

Ənisü münis olmuş səndən ayrı,
Mənə fəryad, ah, əfğan əmoğlu.

Nə təndə bir libasım, başda mə'cər,
Qoyubdur ləşgəri-üdvan, əmoğlu.

Gedim qoy Şamə mən üftan-xizan,
Piyadə, başaçıq, giryan əmoğlu.

Gəlib ney tək nəvayə Neynəvada,
Sızıldar bu dili-nalan əmoğlu.

Diriğa, həsrəta, aha, fəğana,
Kəsiblər başını ətşan, əmoğlu.

Qaradaği bu nari-möhnətindən,
Çəkib dağ köksünə hər yan əmoğlu.

Onun fəryadına rüzi-cəzada,
Yetiş yandırmasın nəyran, əmoğlu.

Əlində toy hənası, yoxsa qandır?
Tutub cismin sərapa qan, əmoğlu.

Gedən dəm sən o meydani-bəlayə,
Bəlayə düşdü canım, can əmoğlu.

Nə dildə tab var, nə canda taqət,
Əyibdir qəddimi hicran, əmoğlu.

Tökər qan gözlərim sənsiz cahanda,
Budur vəhmim edə tufan əmoğlu.

## XAN QARADAĞİNİN ŞE'Rİ

Yaran, görüm bu könlümü büryanə ağlaram,
Kim od vurubdu xirmənə-imkanə, ağlaram.

Ney tək nəvalanıb, yenə dil bəndi-bəndidən,
Salmış şərarə ahı, neysitanə ağlaram.

Süzü güdaz fövcinə məğlubi-əsrkən,
Şurü nəşur saldı könül canə, ağlaram.

Faş etdi xalqa dideyi-qəmmaz, əşkbar,
Seyri-dərunu sineyi-suzanə ağlaram.



Muyəkünan suz-güdaz ilə şəm' üzə,
Pərvanəvar odlana-odlana ağlaram.

Könlüm məqami-zülfi-pərişanın eyləyib,
Rəhm eylə özümə pərişanə ağlaram.

Lalə misal dağa düşüb, yadi-lə'l edib,
Həsrət odu ilə dağlana-dağlana ağlaram.

Ahü fəğan adətidir sübhü şamlar,
Oğrun, bəlalı bu dili-nalanə ağlaram.

Getdi vüsal, gəldi Qaradaği hicri-yar,
Yə'qubvar Yusifi-Kən'anə ağlaram.

## NACİNİN NÖVHƏSİ

Əhli-Mədinə, bilin imdi əyan ağlaram,
Öldürür axır məni dərdi-nihan, ağlaram.

### FƏRD

Mədinə əhli, nələr üz verib məni-zarə
Ki, dəstə ilə bizi Şümr çəkdi bazərə.

### NÖVHƏ

Əhli-Mədinə gedin rövzeyi-Peyğəmbərə,
Verməyə başsağlığı Fatimeyi-müztərə,
Başa vurun, ağlayın, qara çəkin minbərə,
Çünki ölübdür hamı pir-cavan, ağlaram.

### ƏFRAD

Yatəndə rövzəyə Zeynəb qəmü məlal ilən,
Yıxıldı qəbri-Bətul üzrə əşki-al ilən.

Dur ey qabırğaları zülm ilə sınan Zəhra,
Hüseynin tərəfindən başın sağ olsun ana.

NÖVHƏ

İstəmişəm ağlayam şur ilə qardaşıma,
Şümr aman verməyib, qamçı vurub başıma.
Eyləməyib rəhm bu gözdən axan yaşıma,
Cövr-cəfadan olub qəddi kaman, ağlaram.

ƏFRAD

Təəccübəm ana Zəhra, o Şümr kinəsinə,
Ayağı çəkməli çıxdı Hüseyn sinəsinə.

Necə çıxar bu yadımdan ki, ah-ah, ana can,
Hüseynimin başını kəsdi Şümri-dun daldan.

NÖVHƏ

Bu necə yaddan çıxar, Şümri-şərir, dəğa,
Sineyi-məcruhinə qoyddu qədəm, ya əxa!
Başını kəsdi susuz, etmədi şəri-həya,
Vurdu Sinan həlqinə nöki, sinan, ağlaram.

ƏFRAD

Gedəndə Kufəara məclisi-ziyadə başın,
Cida olub bədənindən çıxıb cidayə başın.

Məgər kəsik başa, Allah, bu qədər zəhmət olur?
Qoyanda Xuli-tənurə kül üstə rahat olur?

NÖVHƏ

Verdi Rzaya Hüseyn əmri-qəzayə başın,
Oldu bədəndən cida, keçdi cidayə başın.

Dözdü bu qədri qəmə, cövr-cəfayə başın,
Xuli-tənurunda kim tutdu məkan, ağlaram.



ƏFRAD

Durub yerindən o dəm Leyliyi-ələmpərvər,
Zəbani-hal ilə səsləndi vay Əliəkbər.

Fəraq odu ilə yanıbdı mənim də canım vay,
Nə dillər ilə deyim Əkbəri-cavanım, vay?

NÖVHƏ

Leyla salıb yadına Əkbəri-gülpeykəri,
Doldurub əfqan ilə rövzeyi-Peyğəmbəri.
Əhli-Mədinə, bilin öldürdülər Əkbəri,
Gülşəni-eyşim solub, oldu xəzan, ağlaram.

ƏFRAD

Necə çıxar bu yadımdan gedəndə meydanə?
Ki, su tapılmadı bir zülfün eləyim şanə.

Nə deyim ki, ləşgəri-Kufə o zülfi-əfşanə,
Ki, şanə çəkdilə tiğ ilə, batdı al-qanə.

NÖVHƏ

Kaş öləydim o gün, ey məhənvər oğul,
Vurdu başından qılıc münqəz kafir, oğul.
Oldu qara tellərin qan ilə əhmər, oğul,
Doldu ala gözlərin qırmızı qan, ağlaram.

ƏFRAD

Durub ayağa, Səryə töküb üzə qan-yaş,
Dedi, İlahi, necə səbr edim məni-külbaş?

Mədinə əhli soruşsa ki, Qasimim nə oldu?
Ərusunun üzünü toy hənası qan oldu.

NÖVHƏ

Rövzeyi-Peyğəmbəri etməyə beytülhəzən,
Harda qalıb, gəlmədi şahi-Hicaz, Yəmən?
Başıma küllər olub, Qasimi ölmüş Hüseyn,
Qəsmətim olmuş mənim ah-fəğan, ağlaram.

ƏFRAD

Düşən zəmanədə dərd-bəlayə canım, vay,
Toyu əzayə dönən Qasimi-cavanım, vay.

Oğul, sənə gündüz işim fəğan olacaq,
Hüseyn məzarı mənə mənzil, məkan olacaq.

NÖVHƏ

Gctdi əlimdən mənim tabü təvanım, oğul,
Cari olubdur üzə əşki-rəvanım, oğul.
Toy otağın boş qalıb, ah cavanım, oğul,
Qəlbimi dağ etdi bu dərdi-nihan, ağlaram.

ƏFRAD

Mənim də varım idi bircə əşrəfi-nasım,
Diyari-Kərbübəlada vəfalı Abbasım.

Necə deyim ki, onun ləşgəri-cəfa tö'əm,
Su üstə hər iki qollarını ediblə qələm?

NÖVHƏ

Ağladı Gülsüm o dəm, Zeynəbə üz verdi qəm,
Zikr olub Abbas adı, tutdu cahanı ələm.
Düşdü qələmdən adın, qolların olmuş qələm,
Düşdü yerə qaməti, sərvi-rəvan, ağlaram.



ƏFRAD

İlahi, Ali-Rəsulun fəğanı hörmətinə,
Hüseynin Əkbəri Qasimi-cavanı hörmətinə.

Bağışla cümlə əzadarı qolsuz Abbasə,
Hüseyni-təşnələbin cismi-canı hörmətinə.

NÖVHƏ

Ağlagilən, Naciya, naləyi-əfğan ilən,
Bizim əzada otur sineyi-suzan ilən,
Zikr elə bu mətləbi dideyi giryan ilən,
Ta nə qədri vardı bu cismdə can, ağlaram.

## NACİ

Əya güruhi-kufian, Hüseynin Əkbər oğluyam,
Vuran şərarə düşmənə, şəhi-Qəzənfər oğluyam.

Atam şəhidi-Kərbəla, babamdı şahi-Ləfəta,
Bilin ki, cəddi-əmcədimdi çünki Xətmi-Ənbiya.
Odur şəfiyi-asiyan, odur cəzada rəhnüma,
Olan cəmi'i-ümmətə şəfi, məhşər oğluyam.

Əya, lə'ini-malimanü ey güruhi-şamian,
Bu gündə cəngi-xeybəri gərək sizə edəm bəyan,
Gərək rəvan ola bu gün bu Kərbəla çölündə qan,
Pozam tamam səfləri, bilin ki, Səfdər oğluyam.

Bilin siz ey lə'inlər ki, mən Əliəkbərəm,
Qəttal cəng etməyə bu gündə misli-Heydərəm.
Bu qövmi bərhəm etməsəm bilirsiz əl ki çəkmərəm,
Əmiri-Xeybər öldürən... Xeybər oğluyam.

Xədəngi-zülmə qıldınız nişanə həlqi-Əsğəri,
Ətəş oduna yandı düz bu gündə Ali-Heydəri.

Şəhidi-xəncər eylədiz Həbibi-Övni-Cəfəri,
Bu qanı yerdə qoymaram, qoyuri-Heydər oğluyam.

Çi fayda, ətəş alıb əlimdən ixtiyarımı,
Bacım Səkinənin ətəş səsi kəsib qərarımı.
Su istəməm bu təşnənin dağıtsa qəlbi-zarımı,
Behiştə gözləyir yolum, əmiri-kövsər oğluyam.

Yolumu gözləyir anam, durubdu ixtiyarsız,
Gedib əlindən Əkbəri, qalıbdı çün qərarsız.
Nə yar, nə müini yox, qalıbdı qəmküsarsız,
O bikəs əlilənin ki, yari-yavər oğluyam.

Mən etmişəm əzəl günü şəhadət əmrini qəbul,
Bu əmrdən yəqin edin ki, zərrə olmaram məlul.
Gəlin bu şahi-təşnənin itaətin edin qəbul,
Cəzada xalqa təlim edən o şiri-dilavər oğluyam.

Qərəz, tamam edib sözün o nəsli-pak Heydəri,
Pozub tamam səfləri, dağıtdı cümlə ləşgəri.
Yetişdi qəlbi-ləşgərə, qələm edib ələmləri,
Deyirdi şahi-təşnənin bilin ki, əjdər oğluyam.

Gülzarı düşdü bir yerə nə gördü Övni-Cəfəri,
Düşübdü xak-xunara, füzun olubdu qəmləri.
Düşüb yerə üqabdan, qucaqlayıb bədənləri,
Dedi köməksiz atamın əmi, mən Əkbər oğluyam.

Yetişdi münəqəzi-lə'in, nizam verdi ləşgərə,
Çalındı kus, təbl, ney, hücum ediblə Əkbərə.
Əlinə xəncərin alan həvalə etdi o sərvərə,
Səda edirdi Şümri-dun ki, mən sitəmgər oğluyam.

O qədri yara vurdular, düşüb o şəh mədardan,
Üqab onu gətirdi bir qəbileyi-küffardan.
Qəbilə əhli gördü bir cavan gəlir kənardan,
Həzin-həzin deyir, anam yolumu gözlər, oğluyam.



Həmişə ağla Əkbərə, bu qəmfəzada Naciya,
Şəfidir yəqin sənə, o şəh cəzada, Naciya!
Buyurdu əhli-Kufəyə o şahzadə Naciya!
Şəbihi-Mustafa mənəm, xətibi-minbər oğluyam.

## MOLLA XƏLİL ŞAKİNİN NÖVHƏSİ

Ey bəradər, can Hüseyn, bu şivənü qovqa nədir?
Dəmbədəm bu ahü, bu fəryadi-vaveyla nədir?

Bu kəlami-qəmfəza hər dəm ki, eylərsən bəyan,
Artırır dərdü qəmim, eylər məni çox natəvan.
Çün belə məlum olur yoxdur həyatından güman,
Zeynəbə səndən sonra dünyavü mafiha nədir?

Gərçi Zeynəbdir adım, binti-Bətuli-əzhərəm,
Xahəri-qəmdidəyəm, amma kənizi-kəmtərəm.
Mən də qardaş sən kimi müştaqi-əmri-davərəm,
Cilvəgahi-eşqdə ədna nədir, ə'la nədir?

Firqeyi-əşrarda yox e'tibarü e'tiqad,
Göz dikibdir qətlinə zülmlə bu qövmi-inad.
Heyf kim, vacib deyil övrətlərə cəng-cihad,
Ta olam qurban sənə, hər dəm bu istiğna nədir?

Çün müqərrərdir gərək çəksin cəfa Ali-Rəsul,
Olmazam hərgiz cəfayi-əşqiyadan dil məlul.
Gərçi çox müşgildi hicranın, vəli qıllam qəbul,
Aşiqi-biçarəyə rahət nədir, iza nədir?

Narə vurmaqda özün olmaz həzər pərvanədə,
Sər bürühnə mən dolannam məclisi-biganədə.
Altı ay qallam yolunda güşeyi-viranədə,
Bilmənəm mənzil nədir, məskən nədir, mə'va nədir?

Çün bu səhrada yetibdir qətlinə fərman sənə,
Heyf ki, mümkün deyil qurban edəm mən can sənə.

Mən də verrəm bu iki tifli bu gün qurban sənə,
Həqqə qurban olmağa Süğra nədir, Kübra nədir?

Gər çəkəm bu dəştdə yüz min qəmü dərdü bəla,
Bimühaba səbr qıllam ta dəmi-ruzi-cəza.
Qanlı əmmamən əlimdə həşrə gəlləm ya əxa!
Bilmənəm məhşər nədir, kövsər nədir, Tuba nədir?

Ərz qıllam Barilaha, ku Hüseyn, ku Kərbəla?
Ku Yezidi-bihəya, ku Xuliyü Şümri-dəğa?
Məhşərə bir şur sallam titrəsin ərşi-Xuda,
Bilməsinlər heç hövli-məhşəri-Kübra nədir?

Çün bu matəmdə olub zərrati-aləm dilqəmin,
Şakiyi-dilxəstəyəm, ollam əzadari-həzin.
Eylə düşmüş başıma şövqlə bu şuri-Hüseyn,
Bilmənəm təb'imdə bu imla nədir, inşa nədir?

## MİRZƏ ƏLƏSGƏR NÖVRƏSİN NÖVHƏSİ

Verən bu qürbət içrə can, Səkinə,
Yetimü bikəsü nalan Səkinə.

Quru yerdə yetimlər can verərmiş,
Olubdur göz yaşım ümman, Səkinə.

Bibin Zeynəb öləydi, görməyəydi,
Səni bu növlə giryan, Səkinə.

Xaraba içrə üç gün ac qaldın,
Xarab olsun belə dövran, Səkinə.

Qolun bağlandı, qırx gün mənzil oldu,
Sənə bu məscidi-viran, Səkinə.

Hanı Əkbər, gəlib sən can verəndə,
Təlavət eyləsin Qur'an, Səkinə.



Bu qəbrin üstünə məni-bəxti-qarə,
Edim bu zülfümü əfşan, Səkinə.

Ədavətlə məni axır gətirdi,
Piyadə yolları üdvan, Səkinə.

Nə kafurü nə sidrü nə kəfən var,
Pozulsun rövnəqi-imkan, Səkinə.

Hanı Əkbər, səni qoysun məzarə,
Olan bu sinəsi suzan, Səkinə.

Ana, ya Fatimə, gəl Şami-şumə
Ki, verdi canını ətşan Səkinə.

Necə izhar edim axır olubdur,
Qəmin aləmdə bipayan, Səkinə.

Sənə Növrəs həmişə növhəxandır,
Gecə-gündüz çəkər əfqan, Səkinə.

## YƏHYA BƏY HACIBƏYOV ŞEYDANIN SİNƏZƏNİ

Kərbəlada ey şibhi-Mustafa,
Getmə meydanə növcavan Əkbər!

Bikəsəm oğul, yoxdu yavərim,
Ey məni-zarə həmzəban, Əkbər.

Səbr qıl bir dəm növgüli-Zəhra,
Qalmasın baban bikəsü tənha.

Yolları sənsiz madərin Leyla,
Şamə tək gedər natəvan Əkbər.

### ƏFRAD

Tərəhhüm eylə mənə, bikəsü zəliləm mən,
Bu qəmli çöldə sənə Əkbərim, dəxiləm mən.

Rəva olurmu əya növcavan, mehrliğa,
Qolunda qəl gedə Şamə madərin Leyla?

### NÖVHƏ

Zülm edir hər dəm ləşgiri-kinə,
Qolları bağlı nazlı Səkinə.
Dari-möhnətdə mahi-Mədinə,
Qan tökür gözdən hər zaman Əkbər.

### ƏFRAD

Nə günə səbr edərəm Əkbərim firağında?
Səni görəndə bala, atların ayağında?

Nə günə səbr edərəm ey oğul bu möhnətə mən?
Düşəndə Kərbübəlada böyük məzillətə mən.

### NÖVHƏ

Səbr edim necə mən firağında,
Qalsa qamətin at ayağında?
Əhli-Şamlar sol və sağında,
Gəh vurar nizə, gəh sinan, Əkbər.

### ƏFRAD

Nə günə səbr eləyim ey oğul məni-naşad?
Bu Kərbəlada səni etmədim Əli damad.

Gərək həmişə vuram başıma məni-xəstə,
Görəndə qamətini isti qumların üstə.



### NÖVHƏ

Ey güli-Zəhra, şibhi-Peyğəmbər,
Mahi-məhru, gülşəni-Heydər,
Bax bu Leylayə ey məhi-ənvər,
Olmasın sənsiz bağrı qan Əkbər.

### ƏFRAD

Fəraqın ilə olur Kərbəlada bağrım qan,
Bu əhli-kinə edir xahərin Dəməşqə rəvan.

Qolumda qəl çəkir gəhi ləşgəri-ə'da,
Gəhi piyadə gedir Şamə madərin Leyla.

### NÖVHƏ

Qollarım bağlar ləşgəri-ə'da,
Şamə əzm edir madərin Leyla.
Ərşətək çıxar şuri-vaveyla,
Ah-naləmdən əlaman Əkbər.

### ƏFRAD

Yetər əyali-Hüseynə həzar dərd-tə'əb,
Xərabələrdə qalır binəva bibin Zeynəb.

Nə bir müin, mədədkar, nə bir nəfər yavər,
Xərabələrdə nə fərş, nə baliş-bəstər.

### NÖVHƏ

Toy-büsatına vermədim nizam,
Etmədim, oğul, zinətin tamam,
İndi ərsədə firqeyi-zülam,
Cisminə vururlar sinan, Əkbər.

ƏFRAD

Bu qəddi-qamətə yetsə zaman Əliəkbər,
Üzündə məhv olur asari-hüsni-Peyğəmbər.

Məlali-hicr ananın eyşni mərarət edir,
Xərabələrdə mənə şamilər şəmatət edir.

NÖVHƏ

Gülzarından dərmədim güllər,
Qarətə gedir zivərim yeksər.
At qabağında, başda yox mə'cər,
Eylərəm fəryadü fəğan, Əkbər.

ƏFRAD

Yoxumdu kimsənə Kərbübəlada dadə gedəm,
Rəva olurmu Əli yolları piyadə gedəm?

Nedim, nə çarə qılım ey oğul məni-müztər,
Bu Kərbəlada qalır südəmər Əliəsğər.

NÖVHƏ

Ey Əliəkbər, ey məhi-yekta,
İltimas eylər madərin Leyla.
Yanmasın narə binəva Şeyda,
Çün olub sənə növhəxan, Əkbər.

## YƏHYA BƏY ŞEYDANIN MƏRSİYƏSİ

Bu sür'ət ilən getmə meydanə Əliəkbər!
Salma məni vəslindən ey vay hicranə Əliəkbər.

Ey tazə cavan Əkbər,
Ey sərvi-rəvan Əkbər,
Bu möhnəti-hicranə,
Yox məndə təvan Əkbər.



ƏFRAD

Tərəhhüm eylə məni-zari-natəvanə, Əli,
Şərari-ahım edər övc asimanə, Əli.

Gözüm önündən iraq olma, ey gözüm nuru
Ki, firqətində dönür qamətim kəmanə, Əli.

NÖVHƏ

Ey növgüli-gülzarım,
Qəmxari-mədədkarım.

Qoyma məni zülmətdə,
Ey vay xürşidi-pürənvarım.

Sən gətsən olur bərhəm,
Bu rövnəqi-bazarım.

Hər sübhi-məsa gəlləm,
Ey vay əfğanə Əliəkbər.

Getmə Əli meydanə,
Salma məni hicranə.

Heyfdir bata zülfün,
Zülm ilə oğul, qanə.

*ƏFRAD*

Necə rəvadı düşə gül kimi əziz bədənin,
Quru yer üstə ola oxlara nişanə, Əli.

Rəva deyil ki, məni Şümri-dun əsir apara,
Əlimdə qara saçım, gəlmişəm amana, Əli.

NÖVHƏ

Çün rəsmdir aləmdə,
Ey sərvi-qəmər təl'ət
Xürşid gedən vaxtda,
Ey vay, afaqı tutar zülmət.

Meydanə gedən hərgiz,
Etməyir Əli, rüc'ət.
Qoyma məni bu çöldə,
Ey vay, divanə Əliəkbər.

Ey munisi-can Əkbər,
Tavusi-cinan Əkbər,
Ey bürci-şərəf mahı,
Ey ruhi-rəvan, Əkbər.

ƏFRAD

Firaq vaxtı deyil, eyləmə bu gündə səfər,
Qalıbdı xeymədə yalqız şəhi-zəmanə Əli.

İti qılınclar ilə doğrasa bu qövm səni,
Gərək həmişə gələm ney kimi fəğanə, Əli.

NÖVHƏ

Bu vadiyi-qürbətdə qaldım, Əli, zillətdə,
Ey vay, qoyma məni zülmətdə.
Ey mehri-cahan mahım.

Mehri-ənvərim sənsən,
Nəcmi-əxtərim sənsən.
Gülzarı məhəbbətdə,
Gülbərgi-tərim sənsən.

Rəhm eylə məni-zarə,
Bu guşeyi-möhnətdə
Şəm qədinə ollam
Ey vay, pərvanə, Əliəkbər!

ƏFRAD

Fəraqi-ruyin ilə, ey sərvəri-qəlbi-həzin,
Gələrmi xab dəxi çeşmi-xunfəşanə, Əli?



O qədər ataşi-qəm eləyib mənə tə'sir,
Əyibdi rast qədim, döndərib kəmanə Əli!

NÖVHƏ

Sən qürrətül-eynimsən,
Həm dürri-səminimsən,
Bu xaneyi-çəşmimdə,
Ey vay, firdovsi-bərinimsən.

Hər dərdü bəlalarda,
Dildari-müinimsən,
Məhrəm deyil əsrarə,
Ey vay, biganə Əliəkbər.

Ey məhrəmi-əsrarım,
Ey yavəri-qəmxarım,
Qoyma gözümü yolda,
Ey gülbəni-gülzarım.

ƏFRAD

Mənim bu halıma rəhm et, amandı, getmə bu gün,
Neçünki yoxdu vəfa qövmi-kufilərə, Əli!

Şəhid olsan əgər, ləşgəri-cəfakirdar,
Vurarlar başıma zülm ilə taziyanə, Əli.

NÖVHƏ

Yaxma qəm hicranə mürği-dili-Leylanı,
Sənsiz yetişir ərşə ey vay, hər ləhzədə əfğanı.
Səndən sonra viranə qalsın belə dövranı,
Döndərdi mənim qəlbim, ey vay, al-qanə, Əliəkbər.

Ey sərvi-səhi, nazım,
Ey məhrəmi-həmrazım,
Meydanə bu sür'ətlə,
Olma ey oğul, azim.

ƏFRAD

Məni ayırma özündən, ey başıbəlalı oğul,
Salıbdır canımı hicrin qəmi nihanə, Əli.

Nə edim, na çarə qılım, ey güli-riyazi-vəfa,
Əsəndə badi-xəzan səhni-gülüstanə, Əli!

NÖVHƏ

Gül cismin Əli görsəm,
Şəmşir ilə sədparə,
Göz yaşım olar cari,
Ey vay, hər ləhzədə rüxsarə.

Çöllərdə gəzər Leyla,
Məcnun kimi avarə,
Qol bağlı çəkər düşmən,
Ey vay, hər yanə Əliəkbər.

Ey Yusifi-dövranım,
Ey mehri-dirəxşanım,
Qoyma məni avarə,
Ey sərvi-gülüstanım.

ƏFRAD

Əlini ver əlimə, mövsimi-firaq yetib,
Dönübdü gülşəni-eyşim bilin xəzanə, Əli!

Əza tuta bizə hər kim, cəzada etmə xəcil,
Səni qəsəm verirəm şahi-insi-canə, Əli.

NÖVHƏ

Şeyda, bu qəmə ağla!
Peyvəstə əza saxla!
Hər mahi-məhərrəmdə,
Ey vay, qəm dəftərini bağla!



Şur ilə gəlib dadə,
Qəlbi-aləmi dağla,
Qoymaz səni yatmağa,
Ey vay, nəyranə Əliəkbər.

Sərmayeyi-rəhmətdir,
Mə'dəni-kəramətdir.

Ruzi-məhşərə tuşə,
Göz yaşı kifayətdir.

## TƏZMİNİ-FÜZULİ

Qəm qübarı yatıb əzbəs dili-viranəmizə,
Kafir ağlar bizim əhvali-pərişanəmizə.

Gülşəni-eyşimi pozmuşdu xəzan əyyamı,
Yetdi bu şaxi-güli-tazə gülüstanimizə.

Arizin şəm'inə pərvanəsifət şövqim var
Ki, çıraq eylədi rövşən şəbi-hicranimizə.

Sübhi-vəslə yuxuda qane olardım şəbi-hicr,
Əgər olsaydı yuxu dideyi-giryanimizə.

Bilməzəm gördüyümüz xab idi yainki xəyal,
Mütləqa xatirə gəlməz ki, gələ yanimizə.

Göz qabağına gətircək təni-məcruhu xəyal,
Sancılır navəki-qəm sineyi-süzanimizə.

Mümkün olmaz nəzərim qanlı müjən peykanı,
Sənə baxdıqca dolur dideyi-giryanimizə.

Əmmə mehmanımız oldu, şəhi-biyar gəlin,
Qılalım sərf nəyimiz varsa mehmanimizə.

Künci-viranədə bir halə düşüb Ali-Rəsul,
Hər gələn qəmli gedər şad gəlib yanimizə.

Yüz şə'f verdi babam bu dili-naşadım üçün,
Ki, qədəm basdı bu gün külbeyi-əhzanimizə.

Eşidib naleyi-fəryadi-dili-zarı yəqin,
Yar rəhm etdi məgər naləvü əfqanimizə?

Künci-viranədə vəslin mənə çün oldu nəsib,
Can verib dilbərə minnət qoyalım canimizə.

Bəsdi bu qədər sitəm ey fələki-kinəşüar,
Az edib cövr-cəfalar qıyasan canimizə.

Var boynumdakı zəncirim üçün çox mə'na,
Müttəsil qılmağa ifşa qəmi-pünhanimizə.

Qan içində görəli türreyi-tərrarilərin,
Dəyməyib şanə əli, zülfi-pərişanimizə.

Barilaha, behəqqi-pənctən, Ali-Əba,
Fəzli-rəhmin ilə yet həşrdə divanimizə.

Ey Füzuli, yetişib dərdü ələm Şeydayə,
Gəlmişik əcz ilə dad etməyə sultanimizə.

## FAİZİN KƏLAMI

Məzlum ölən Hüseyn vay,
Gülgün kəfən Hüseyn vay.

Başı cüda başında
Şama gedən Hüseyn vay.

Səndən sonra Hüseyn can,
Rə'na qədim büküldü.



Hökm etdi Şümri-ləşgər,
Xeyməm üstə töküldü.

Talandı rəxti-zivər,
Qardaş, evim yıxıldı.

Şam əhli qollarıma,
Saldı rəsən, Hüseyn vay.

Hansı bacı yanıbdır,
Mən tək zülmi-cəfada?

Bacı düşmən əsiri,
Qardaş başı cüdada.

Yox ixtiyarım əldə,
Allah yetişsin dadə.

Qaldın əcəb bu çöldə,
Başsız bədən, Hüseyn vay.

Bu idi məndə mətləb,
Ey şahi-dilşikəstə.

Məni sən dəfn edərsən,
Verəndə can bu xəstə.

Gəlib Qur'an oxursan,
Qardaş, məzarım üstə.

Yaxşı murada yetdim,
Məni-bivətən, Hüseyn vay.

Ey cismi parə-parə,
Qəmnak, qəlbi yarə.

Bu başsız peykərinə,
Qurban bu bəxti qarə.

Səni ey şəhsüvarım, kimlər qoyar məzarə?
Sənə kimlər təlavət eylər Qur'an, Hüseyn vay.

Hansı bacının mən tək,
Qardaşı olub ətşan?

Dörd min yarə bədəndə,
Torpaqlar üstə üryan.

Səni ceddim veribdir,
Ümmət yolunda qurban.

Harda qalıbdı, gəlməz,
Qurban verən, Hüseyn vay.

Saxla ey xaki-möhnət,
Hüseynimi əmanət.

Budur məhşər günündə,
Xalqa edən şəfaət.

İncitmə çox, sən allah,
Cismində var cərahət.

Vur başa, söylə Faiz,
Şahi-zəmin, Hüseyn vay.

## MƏRHUM BAKİNİN NÖVHƏSİ

Qoy qucağından yerə bir ləhzə madər başımı,
Torpaq üstə ta görə ceddim Peyğəmbər başımı.

Qumlar üstündə gərək qalsın Əliəkbərim,
Can qucağımda gərək versin Əliəsğərim.
Ərməğan olsun gərək həm əngüştərim,
Bihəyalıq eyləyib kəssin o xəncər başımı.



Üç gecə-gündüz quru yerdə gərək qalsın bədən,
Nizələr tabutum olsun, Kərbəla xakı kəfən.
Qalmasın heç bir libasım təndə, hətta pirhən,
Bəzmi-ə'dadə gərək görsün o xahər başımı.

Çün qəza katibləri şərhi-məhəbbət yazdılar,
Eşq mə'nasın, bəli, hər yerdə heyrət yazdılar.
Aşiqin me'racını feyzi-şəhadət yazdılar,
Kəssələr xoşdur mənə hər dəm mükərrər başımı.

Çapsalar sinəmdə at o eyni-rahətdir mənə,
Xeyməgahım odlana bir özgə ləzzətdir mənə.
Aşiqəm canan yolunda eyni-minnətdir mənə,
Nizədə hər yanə gər çəksə bu ləşgər başımı.

Razıyam olmuş rza əzbəski cananım mənim,
Belədir ruzi-əzəl, əhd ilə peymanım mənim.
Ta axa dörd min yaradan çöllərə qanım mənim,
Qoysalar xoşdur mənə gül üstə yeksər başımı.

Başaçıq ceddim gərək hər ləhzə fəryad eyləsin,
Möhtərəm bacılarım dünyanı bərbad eyləsin.
Qızlarım hər ləhzədə bir nalə bünyad eyləsin,
Çün susuz daldan kəsib Şümri-sitəmgər başımı.

Şiələr qan ağlayın, ah ilə fəryad eyləyin,
Mən sizə baş vermişəm, siz də bir imdad eyləyin.
Su içən vaxtda mənim əhvalımı yad eyləyin,
İstədim su vermədi, kəsdi o kafər başımı.

Şiələr, mən natiqi-ayati-Qur'anəm sizə,
Mərkəzi-dini-şəriət, rükni-imanəm sizə.
Hər zaman göz yaşına bir ahə mehmanəm sizə,
Mərhəmi göz yaşıdır, hər kimsə istər başımı.

Ya Hüseyn, çoxdur, günahım, ondan azad istərəm,
Kafir, kibr, yəhudəm, səndən imdad istərəm.
Bakiyəm, üqba evin hər ləhzə abad istərəm,
Adını vird eyləyib, yollam sərasər başımı.

## ŞUŞALI SABİRİN NÖVHƏSİ

Çün tapdı Hüseyn ibn Əli feyzi-şəhadət,
Hökm etdi Əmri-Sə'd çalın təbli-bəşarət.

ƏFRAD

Müqərrər etdi o dəm ibni-Sə'd-bədəxtər
Ki, nə'şi-şahi-şəhidanı dəfn eləyələr.

NÖVHƏ

Bu vaqiədən Ali-Əli baxəbər oldu,
Gülsüm ilə Zeynəbdə dəxi qalmadı taqət.

ƏFRAD

Fəda olum sənə mən, ey Səkineyi-dilxun,
O növ ilə kim, ol şah olmasın mədfun.

NÖVHƏ

Gəl bari Əmri-Sə'də yetir sən bu pəyamı,
Etməzmi bizə bir bu qədər zülm kifayət?

ƏFRAD

Əlin üzünə qoyub ol Səkineyi-müztər,
Əmir çadırına eyləyib o dəmdə güzər.

NÖVHƏ

Getdi o qızın qətlgəhə düşdü güzarı,
Gördü babasın, etdi ona xeyli şikayət.

ƏFRAD

O vaxtdan ki, gedibsən baba, bu Şümri-dəni,
Başıma qamçı vurub, həm çox incidibdi məni.



NÖVHƏ

Əfğanə gəlib qətlgahi keçdi xülasə,
Əmr etdi qoşun əhlinə ki, əhli-şəqavət.

ƏFRAD

Bilin Hüseyn qızıyam, xeyli ehtiramım var,
Əmir çadırını göstərin, pəyamım var.

NÖVHƏ

Çün baxdı qoşun əhli onun halına söyləb,
Kimdir, bu ki, var bunda belə hüsni-fəsahət?

ƏFRAD

Eşitmişəm ki, bu gün əmr edibsən əz rəhi-kin,
Ağamı dəfn eləsinlər bu qövmi-bədayin.

NÖVHƏ

Dəfn eyləməyin cismi-şərifini Hüseynin,
Dəfn eylər onu Şiri-Xuda, xətmi-Risalət.

ƏFRAD

Atamı dəfn eyləməyin ey əduyi-Ali-əba
Ki, görməyə gələcək oğlunu anam Zəhra.

NÖVHƏ

Durmuşdu o Sə'd oğlu hələ büğzla sakit,
Hökm etdi o dəm Şümri-dəni, kani-qisavət.

ƏFRAD

Gərək cidada başın Şamə ərməğan aparam,
Hüseyn, Fatimənin nəşi üstə at çaparam.

NÖVHƏ

Dəfn eyləmərəm, at çaparam nə'şinin üstə,
Əzbəski varımdır o qədər büğzi-ədavət.

ƏFRAD

Fəğan ilən dedi ey zari-qəm, nəsib baba,
Əyalı düşmən əlində qalan qərib baba.

NÖVHƏ

Nə'ş üstə gərək at çapıla, böylədi fərman,
Get əmmənə ver bu xəbəri, istə bəşarət.

ƏFRAD

Oturma bircə sən, ey fizzeyi-mələkmənzər,
Bu qəmli vaqiəni vergilən o Şirə xəbər.

NÖVHƏ

Ey fizzə, gedib eyləgilən şiri sən agah,
Gəlsin eləsin nə'şləri bəlkə himayət.

Hüzzar eləsin qismət ilə Sabirə, yarəbb,
Qəbrində edək növhəvü həm şuti-ziyarət.

## BAKİNİN NÖVHƏSİ

Şiələr, qanə batıb ol şəhi-lövlak bu gün,
Fatimə başın açıb, sinə edər çak bu gün.

Düşdü atdan yerə çün padşəhi-Kərbübəla,
Əmri-İlahi yetişib cümlə mülk geydi qara,
Lərzəyə düşdü, bəli, küngireyi-ərşi-Xuda,
Tirə-tar oldu hava, titrədi əflak bu gün.



Şiələr etdi imam əhdinə peyman, axır,
Verdi yüz şövq ilə yetmiş iki qurban, axır.
Bir həya eyləmədi Şümri-bədərkan, axır,
Başını kəsdi susuz, eyləmədi bak, bu gün.

Ya Hüseyn, hansı peyəmbər belə fərman verdi?
Oğlunu, qardaşını ümmətə qurban verdi?
Gün qabağında, qum üstündə susuz can verdi,
Ağladı halətinə pak ilə napak bu gün.

Əhli-Qur'an eylədi hörmət əcəb Qur'anə,
Rükni-məzhəb pozulub, rəxnə yetib imanə.
Od düşüb bargəhi-dinə, olub viranə,
Yandı dibaçeyi-şə'r içrə o əmlak bu gün.

Kərbəla vaqiəsi etdi qədər qəddini xəm,
Tar-mar oldu qəza mülkü, pozuldu aləm.
Məhv olub lövh xətti, ah ki, süst oldu qələm,
Qürsi-xurşid edər seyrdən imsak bu gün.

Kərbəlayə başaçıq həzrəti-İsa gəldi,
Başın əldə gətirib, həm Zəkəriyyə gəldi.
Yusif, Yunis, Əyyub ilə Yəhya gəldi,
Ənbiyalər başına tökdü fələk xak bu gün.

Dəmbədəm başə vurub nalə edər Mikayil,
Ağlayır sübhi-məsa-şivən ilə İsrafil.
Əli qoynunda qalıb həşrə kimi Cəbrayil,
Bəski Peyğəmbər olub ərşdə qəmnak bu gün.

Naləvü şurə dəxi külli-cəmadat gəlib,
Va Hüseyn, zikri ilə dərdə nəbatat gəlib.
Həm nəvayə dil açıb, cümleyi-zərrat gəlib,
Ağıl matəmzəd olub, ağladı idrak bu gün.

Qisseyi-Kərbübəladan qəmər olmuş münşəq,
Qara xətt ilə yazılmış o səbəb kəlmeyi-həqq.
Qüsseyi-Kərbübəlanı yaza bilməz mütləq,
Nitqi-Baki nə qədər kim ola çalak bu gün.

## MOLLA MƏHƏMMƏDİN NÖVHƏSİ

Nə rəvadı bu nazlı bacın, qardaş,
Dolana bu çölləri avarə?
Qolu bağlı gəzə bu biyabanı,
Çəkələr bu küçə-bazarə.

O camalına müştaqəm Əli can,
Nə könüldə səbr, nə aramım,
Bu xaraba məkanda giryanım,
Keçər üsrət ilə Əli əyyamım.

Nə füruş çıraq, həsir libas,
Olur yeksan ruz ilə həm şamım.
Bu xarabada can verəcək bacın,
Sən ilə ta gəlməyə güftarə.

Yol uzaq, dəvə üryan, başım açıq,
Gəzirəm bu ölkədə bimə'cər.
Nə məkandı, nə yer, nə xərabədi bu?
Ki, dönübdür göz yaşım ümmanə.

Edər əhli-cəfa nə şəmatətlər,
Bu Səkinəni bil yetirib canə.
Bu bəlayə, bu zülmə, bu cəfayə,
Nəzər et bu firqəti-hicranə.

O təriqi-vəfayə bulub qardaş,
Nəzər et bu dideyi-xunbarə.
Nə rəvadı bu ləşgəri birəhmə,
Bu Səkinə ola Əli həmvarə?

Xəm olub qəddim Əli, zülfün tək,
O qəddə, həm qamətə müştaqəm.

Məni Şümr bu Şamə tərəf çəkdi,
Bu xərabədə daima xunbarəm.
Və cələ lütf li-Məhəmmədtək,
Ona rəhm et, qoyma yana narə.



## SEYYİDİN NÖVHƏSİ

Ey Zeynəb zarı, nalan Hüseynim!
Ey xeyli-xərgahı talan Hüseynim!

Vay ətşan Hüseynim, vay sultan Hüseynim!
Vay ümmət yolunda, vay qurban Hüseynim!
Ey Kə'beyi-irfan, çox möhtərəmsən,
Türbət məqamına qoydun qövmsən.
Ey sərvərim, sən ahuyi-hərəmsən,
Kim verdi qətlinə fərman, Hüseynim?

Vay ətşan Hüseynim, vay sultan Hüseynim!
Vay ümmət yolunda, vay qurban Hüseynim!

Ey ali-Heydərin qəmxarı qardaş,
Kərbəla dəştinin sərdarı qardaş.
Dur yola sal ali-əthari qardaş,
Ey gülşəni-Qüdsə mehman Hüseynim.

Vay ətşan Hüseynim, vay sultan Hüseynim!
Vay ümmət yolunda, vay qurban Hüseynim!

Fəxr etməsin çox da Xəlili-Azər,
Sənsən Xəlili-həqq, İsmayili-əkbər.
Hacər deyil bu Leylayə bərabər,
Ey Əkbəri olan qurban Hüseynim!

Vay ətşan Hüseynim, vay sultan Hüseynim!
Vay ümmət yolunda, vay qurban Hüseynim!

Ey tuti-güftarım Əkbəri-məhru!
Vəşşəms rüxsarım, vəlleyl giysu!
Bu kakili-mişkin, bu çeşmi-ahu,
Oldu bu səhrada ətşan Hüseynim.

Vay ətşan Hüseynim, vay sultan Hüseynim!
Vay ümmət yolunda, vay qurban Hüseynim!

Hər il bu matəmdə qan ağla Seyyid,
Əşki-əza tökūb, yan, ağla Seyyid.
Ver bu müsibətdə can, ağla Seyyid,
Ta dərdinə qılsın dərman Hüseynim.

Vay ətşan Hüseynim, vay sultan Hüseynim!
Vay ümmət yolunda, vay qurban Hüseynim!

## KƏRBƏLAYİ-YUSİFİN KƏLAMI

Madəri-Əsğər gördü nagəhan,
Əsğər eləyir şur ilə fəğan.
Söylədi, oğul, ah, ələman,
Ağlama Əliəsğər, ağlama!

ƏFRAD

Bu gündə ağlama, şirinzəban Əliəsğər,
Ola Fərat suyu kaş qan, Əliəsğər.

Sənin kimi susuzam, xüşk olubdu püstanım
Ki, bir içim suya yoxdur güman, Əliəsğər.

NÖVHƏ

Bilsin anan qürbət ellərdə,
Qalmışam oğul, qara günlərdə.
Yoxdu şərh edəm tab dillərdə,
Ağlama! Əliəsğər, ağlama!

ƏFRAD

Nə edim? Nə çarə, qəribəm, qərib, anan ölsün,
Bu dərdi çəkməyə yox məndə can, Əliəsğər.

Başıbəlalı bala, bircə ləhzə aram ol!
Bu halına ola bəlkə yanan, Əliəsğər.



NÖVHƏ

Neyləyim oğul, bu məşəqqətə?
Yoxdu taqətim bu müsibətə.
Düşməsin bir kəs belə zillətə,
Ağlama, Əliəsğər, ağlama!

ƏFRAD

Görəydi bircə də əfğanını əmin Abbas,
Olaydı kaş ona dərdin əyan, Əliəsğər.

Babandı saqiyi-kövsər, Rəşid əmin səqqa,
Rəva deyil verəsən təşnə can, Əliəsğər.

NÖVHƏ

Canıma düşüb od şərarəsi,
Əsğərim edən ah-naləsi.
Bu susuzluğun yoxdu çarəsi,
Ağlama, Əliəsğər, ağlama!

ƏFRAD

Fəda olum sənə mən, mehriban Əliəsğər,
Məni gəl eləmə sən natəvan, Əliəsğər.

Döşümdə süd quruyubdur zi-bəski acam mən,
Bu qədər eləmə sən əlaman, Əliəsğər.

NÖVHƏ

Bağlayıbdılar su yolun bu dəm,
Sağ deyil əmin, yanına gedəm.
Bu susuzluğa ta əlac edəm,
Ağlama, Əliəsğər, ağlama!

**ƏFRAD**

Nə edim, nə çarə qılım, mən olum sənə qurban
Ki, su deyib eləmə çox fəğan, Əliəsğər.

Nə eləyim, bu qəmə taqət-təvanım yox,
Bahar ömrün olur tez xəzan, Əliəsğər.

**NÖVHƏ**

Olmuşam bu gün dəhrdə məlul,
Əlxətaş edər izzəti-Rəsul.
Qeyrəti-Abbas eləməz qəbul,
Ağlama, Əliəsğər, ağlama!

**ƏFRAD**

Necə görüm ki, solub qönçətək dodaqların,
Olur bu dərd mənə çox yaman, Əliəsğər.

Bu növ ah-fəğan eləmə susuzluqdan,
Yanar bu hala şəhi-üns, can Əliəsğər.

**NÖVHƏ**

Qaldı qoltuqda bu dəm əllərim,
Soldu güllərim, öldü Əkbərim.
Qasım, Abbas, Ovn, Cəfərim,
Ağlama, Əliəsğər, ağlama!

**ƏFRAD**

Şəhid olubdu təmamən bu qövmi-ənsarım,
Sən olmusan mənə bir həmzəban, Əliəsğər.

Yat istirahət elə, mən deyim sənə laylay,
Mənəm sənə hamıdan mehriban, Əliəsğər.



**NÖVHƏ**

Sinə çak olub, eləyir nəva,
Başlayıb Yusif özgə macəra.
Çün xarab olub dəşti-Kərbəla,
Ağlama, Əliəsğər, ağlama!

## CƏNABİ-NƏVVABIN TÖVBƏNAMƏSİ

Həmdi-bihədd sənə ey dadgəri-yövmi-cəza,
Sane'ü ləmyəzəlü həyyu qədimü ə'da.
Ki, nə ne'mətlər edibsən biz nadanə əta,
Leyk küfran edib kim, oluruq hərzə dərə.
Hər zaman tey edərdik bədliklə rahi-xəta,
Rahnüma eyləgilən lütfünü, ey bari-Xuda,
Dəşti-heyrətdə qalıb söylərəm əz ruyi-səfa.
Hər zaman sidqlə key dadgəri-hər dü səra,
Tövbə, yarəbb, bexəta rahına getdiklərimə,
Bilib etdiklərimə, bilməyib etdiklərimə.

Nitq verdin ki, edəm zikr sifatımı əyan,
Əql qədərincə həman qüdrəti-zatını bəyan.
Yol tutam şə'ri-Nəbini, olam ol rahə rəvan,
Şəm' ol rahə edəm həbbi-Əliyi-İmran.
On bir oğlu ilə edəm sabit dinü iman,
Leyk biçarəyəm əz nəfsü bədü bünyan.
Son mədəd qıl bu cihad içrə mənə, ey Sübhan,
Qoyma dəstgir qalam vadiyi-heyrətdə aman.
Tövbə, yarəbb, bexəta rahına getdiklərimə,
Bilib etdiklərimə, bilməyib etdiklərimə.

Ey diriğa ki, əbəs ömrü-əziz oldu fəna,
Keçdi gün bədlik ilə dərdü qəm, möhnətara,
Heyf, səd heyf, cavanlıq ki, olur badi-hava,
Qocalıq vay əgər çəngi-giribanə vura,
Bu hal ilə gələ gör kim səfər üğbayə ola,
Dəst-xali, yük ağır, gözdən uzaq dari-şəfa.

Zerrəcən yox bir əməl ta tuta əl ruzi-cəza,
Sən yetiş dadıma, ey padişəhi-Kərbübəla.
Tövbə, yarəbb, bexəta rahına getdiklərimə,
Bilib etdiklərimə, bilməyib etdiklərimə.

Vay o gündən ki, yetə qərqərəyə can ze məhən,
Qövmü qardaş yığılıb bağlayalar çeşmü dəhən.
Qoyalar taxta kimi üstə quru bədən,
Verələr qüslümü örtə bədən, zari kəfən.
Qoya tabuta məni, şivən edə kudəkü zən,
Ola bir tirə olan cay məni-zarə Vətən.
Nə bir imdad edən ola, nə bir dada yetən,
Sən yetiş dadıma ey davəri zilcudu mənən.
Tövbə, yarəbb, bexəta rahına getdiklərimə,
Bilib etdiklərimə, bilməyib etdiklərimə.

Bu betər hal ilə ol dəmdə behökmi-Yəzdan,
Nagəhan zahir ola sövlət ilə iki cavan.
Deyələr key əziz ömrünü verən badə, oyan!
Söylə sən rəbbini, peyğəmbərini eylə bəyan.
Neylədin dünyada, söylə hamısın, eylə bəyan.
Onların heybətindən lal ola dil, titrəşə can.
Bir belə vaxtda ey qadiri-qəyyumi-cahan,
Yetir imdadıma mövlalarımı ahü aman.
Tövbə, yarəbb, bexəta rahına getdiklərimə,
Bilib etdiklərimə, bilməyib etdiklərimə.

Gözü yolda, dili lal ba dili-məcruh, fikar,
Ol xətərnak məkan içrə bəsədd zarivü zar,
Yolunu gözlərəm, ey dadrəsi-ruzşümar,
Sən özün dadıma yet, qəbrdə, ey cəddi-kübar,
Çünki məddahi-Hüseynü Həsənəm leylü nəhar,
Möhsünəm, dərdkəşi-hübbi-Əliyyi-Kərrar,
Çakirəm, dərgəhüvə əbd dər həştü çəhar,
Əfv qıl cürmümü, ey həyyü kərimi-qəffar.
Tövbə, yarəbb, bexəta rahına getdiklərimə,
Bilib etdiklərimə, bilməyib etdiklərimə.





# ÖN SÖZ

XIX əsr Qarabağ ədəbi mühitinin yetirdiyi tanınmış şəxsiyyətlərdən biri olan Mir Möhsün Nəvvab özündən sonra xalqına gözəl ad, yüksək insani keyfiyyətlərlə yanaşı, 27 mətbu və qeyri-mətbu əsər qoyub getmişdir. Bu əsərlər onu şöhrətləndirmiş, yaşatmış və görkəmli bir alim, şair, rəssam, münəccim, xəttat, musiqişünas, müəllim kimi nəsillərə təqdim etmişdir. Bu əsərlər təkcə onun özünü yox, bütünlükdə XIX əsr Qarabağ ədəbi ictimaiyyətini, onun keşməkeşli taleyini bizə çatdırmışdır. Şairin təkcə "Təzkireyi-Nəvvab" əsərində yüzdən çox qarabağlı şairin adı çəkilir, əsərlərindən nümunələr verilir. Digər əsərlərində müxtəlif peşə sahibləri, alimlər, musiqişünaslar, din xadimləri böyük məhəbbətlə yad edilir. Bu xüsusiyyətlərinə görə, Nəvvab xalqı tərəfindən sevilir və adı çəkiləndə ruhuna rəhmət oxunur.

Bu günlərdə xoş bir təsadüf nəticəsində alimin daha bir əsəri də əldə edildi. Şairin qız nəvəsi Simuzər xanım Ağayevanın təqdim etdiyi 230 vərəqdən ibarət olan karton və dəri üzlüklə cildlənmiş bu əlyazmasında Nəvvabın müxtəlif qeydləri cəmlənmişdir. Əlyazması bizə qədər əldən-ələ keçmiş, hətta onun ağ qalmış səhifələrində başqaları tərəfindən qeydlər də aparılmışdır. Burda ayrı-ayrı şəxslərə məxsus olan bir neçə yazı nümunələri də var. Bu yazıların haşiyəsində Nəvvabın öz xətti ilə "düzdür", yaxud "doğru deyil, yalandır" kimi qeydlərinin olması onu göstərir ki, həmin yazılar şairin sağlığında və onun razılığı ilə qələmə alınmışdır. Əsərin giriş hissəsində o yazır: "...Çox götür-qoy etdikdən sonra Şuşa şəhər sakini Möhsün ibn Əhməd əl-Musəvi belə söyləyir ki, bu bir neçə vərəqin yazılmasının səbəbi odur ki, adamın bəzən dualara və qəribə əməllərə ehtiyacı olur ki, bunları da uzun səyahətlər, saysız-hesabsız çalışmalar nəticəsində əldə etmək olur. Ona görə də bu bir neçə vərəqdə təcrübədən keçirildiyi və keçirilmədiyi qeyd olunmaqla əməllər və dualar verilmişdir".

Əlyazmanın 78-ci səhifəsində (vərəq 39) Nəvvab öz xətti ilə kitabı 1301-ci ildə yadigar olaraq yazdığını qeyd edir. Burda gözəl nəstəliq xətti ilə yanaşı, son dövrlərə aid mürəkkəblə yazılmış yazılara da təsadüf olunur. Həmin yazılardan hiss olunur ki, bu, son zamanların məhsulu olmuş və Nəvvabın ölümündən sonra əlyazmasına əlavə edilmişdir.

Əlyazma ərəb və fars dillərində yazılmışdır. Belə qənaətə gəlmək olar ki, Nəvvab bu əsəri məhdud bir dairə üçün deyil, bütün Şərq xalqları üçün nəzərdə tutmuşdur. Bu səbəbdən də əsəri daha geniş coğrafi məkana malik olan ərəb və fars dillərində qələmə almışdır.

Əsərdə dini mahiyyət kəsb edən bəzi məsələlər, inamlar, məişət üçün vacib olan təcrübələr, təbii yolla müalicə üsulları, dövrü üçün aktual olan gözbağlıca və digər vacib hesab edilən mövzulara toxunulur. Bu xüsusiyyətləri nəzərə alaraq kitabda pərakəndə şəkildə verilmiş həmin mövzuları qruplaşdıraraq ayrı-ayrı başlıqlar altında verməyə çalışmışıq.

Əlyazmasında göstərilən bəzi məsələlər bu gün də öz aktuallığını itirməmişdir. Bəzi dərmanların hazırlanması, kartofun uzun müddət saxlanılması üsulu, su quyularından boğucu qazların xaric edilməsi, gülab, ətir hazırlamaq üsulları, saçın qaraldılması, əzanın gücləndirilməsi və yüzlərlə buna bənzər məişət üçün zəruri sayılan əməllərdən bu gün də istifadə etmək olar.

Kitabda bir neçə duanın yazılma üsulu da göstərilir. Bu dualar şarlatan mollaların xalqı aldatmaq üçün yazdığı dualardan müəyyən xüsusiyyətlərinə görə fərqlənir. Hiss olunur ki, əsas məqsəd müqabil tərəfi psixoloji cəhətdən hazırlamaq, onda müəyyən işə inam yaratmaqdan ibarət olmuşdur. Nəvvabın bu baxımdan bir neçə yanaşma üsulu var. O hətta bir sıra ayələrin oxunuşu və onun faydasından bəhs edərkən özünün tibbi mülahizə və görüşlərini də oxucuya təlqin etməyə, yəni xalqın dinə olan inamından istifadə edərək öz tibbi görüşlərini daha inandırıcı şəkildə ona çatdırmağa çalışmışdır.

Nəvvab apardığı və təklif etdiyi kimyəvi təcrübələri tam dəqiqliyi ilə kimdən öyrəndiyini, kimin əməli olduğunu qeyd etməklə yanaşı, onu təcrübədən keçirib-keçirməməsi haqqında da məlumat verir. Təcrübələrin gedişini təsvir etdikdən sonra onlardan bəzilərinin haşiyəsində "bu, düz deyil" sözləri yazılmışdır. Görünür ki, Nəvvab özü bu məlumatları aldıqdan və onu kitaba köçürdükdən sonra şəxsən yoxlamış və nəticə hasil olmadığı üçün onun yanlışlığına əmin olub, öz qeydlərini aparmışdır. Bu da təbiidir ki, xalq arasında yayılan və çox zaman elmi əsaslara söykənməyən bəzi təcrübələrə tam inanmaq da olmaz. Bu məsələ ilə bağlı kitabın son səhifələrində Nəvvabın öz xətti ilə qələmə aldığı bu sətirlər maraqlıdır. O yazır: "Məxfi qalmasın ki, bəzi vərəqlər bu kitaba sonradan tikilib... (orda yazılanların – *R.K.*) çoxu qələtdir, amma içində bir para nüsxəcat var, demək olar ki, təcrübədən keçmişdir. O, nüsxələrin xatirinə bu kitaba əlavə olundu" (s.258). Nəvvab bununla oxucunu ayıq olmağa çağırır, təcrübələrə açıq gözlə baxmağı, onlara şüurlu şəkildə yanaşmağı tələb edir. Əlyazmanın 218-ci səhifəsindən 257-ci səhifəsinə kimi hər bir səhifənin üstündən xətt çəkilmiş, əksər səhifələrin kənarında Nəvvabın öz xətti ilə "bu əməliyyat təcrübədə təsdiq olunmayıb, yalandır", yaxud "bu, təsdiq olunmayıb, etmə" sözləri yazılmışdır.

Kitabda diqqəti cəlb edən əsas məsələlərdən biri də xalq təbabəti və təbii üsullarla müalicədir. Gizli deyil ki, özünün ən yüksək inkişaf mərhələsini yaşayan tibb elmi, bu gün belə, əsrlərin sınağından çıxmış xalq təbabətindən uzaqlaşa bilmir, əksinə, dönə-dönə ona müraciət edir. Bu baxımdan əsərdə göstərilən müalicə üsulları son dərəcə maraqlıdır. Lakin bu üsulların hamısını bu gün məqbul hesab etmək olmaz. Çünki bunların çoxu artıq öz qüdrətini itirmiş, yeni, daha faydalı üsullarla əvəz olunmuşdur. Ona görə də kitabda göstərilən müalicə üsullarını tətbiq etməzdən əvvəl mütləq həkimlə məsləhətləşmək lazımdır.

***Raqub Kərimov***



## RUHLARLA DANIŞMA ÜSULU

Müqəddəs, yaxud da qeyri-müqəddəs şəxslərlə sual-cavab etmək istəyirsənsə, ağacdan hazırlanmış çox dəqiq, hamar və sığallanmış üçayaqlı stol tapın. Stolun üstü dairəvi olsa, daha yaxşıdır. Onun ətrafında (üz-üzə) iki nəfər oturmalıdır. Hər iki şəxs əllərini (hər iki əlini) açıq şəkildə stolun üstünə elə qoymalıdır ki, onların barmaqlarının ucları bir-birinə toxunsun və öz baş barmaqlarını da bir-birinə toxundursunlar. Əllərin içini stolun üstünə yapışdırmaq lazımdır. Lakin bunu (sərbəst etmək) güc və qüvvətlə etmək lazım deyil. Həmçinin o tərəf-bu tərəfə ləngərlənmək (çevrilmək) də olmaz. Onların hər biri danışmamalı, səs salmamalıdır, dodaqlarını dodaqlarının üstünə qoyub səssiz (sakit) dayanmalıdırlar. O vaxta qədər belə oturmalıdırlar ki, onların hər ikisinə elektrik (enerjisi) qüvvəsi təsir və nüfuz etmiş olsun. Dərhal bu işdə təcrübəsi daha çox olan ikinci şəxs ruha yaxşı, yatımlı kəlmələrlə müraciət edib deməlidir ki, ey təmiz ruh, Allah sənə rəhmət eləsin, əgər gəlmisənsə, stolun bir ayağını tərpət bilək ki, gəlmisən. Əgər ruh gəlmiş olsa, stolun ayağını hərəkətə gətirəcək. Əgər gəlməmiş olsa, bir neçə dəqiqə səbir edib sonra həmin sözləri o vaxta qədər təkrar etmək lazımdır ki, stolun ayağı tərpənsin. Sonra həmin şəxs ruhdan onun adını, şəhərin və məkanının adını soruşur. Sonra nə istəyirsənsə, ondan soruşursan. Əgər o ruh məqsədə uyğun cavab verməsə, acizanə ondan xahiş edirsən ki, gedib istədiyin şəxsin ruhunu gətirsin. Elə ki, o, ruhu gətirdi, onunla sual-cavaba başlayırsan. Sual-cavabın qaydası budur ki, göstərilən qaydaya əməl edilsin, yəni stolun ayağı tərpəndikdə bilməliyik ki, ruh gəlib və (yatımlı) yumşaq sözlərlə onu sorğu-sual edirik ki, ey pak ruh, biz əlifbanı əlifdən axıra qədər söyləyəcəyik, o hərflərdən hansı sizin adınızda olsa, o zaman stolun ayağını yerə vuracaq. Sonra əlifbanı oxumağa başladım. "Əlif", "ba", "pa", "ta", "sa", "cim", "him", "ha", "xa", "dal", "zal", "ra", "za", "ja", "sin". Elə ki, "sin"i dedim stolun ayağı yerə dəydirildi. Bildim ki, o ruhun adının əvvəlinci hərfi "S"-dir. Onu üçüncü şəxs kağıza yazdı. Sonra "şin", "sad", "zad", xülasə, "lam"-a qədər çatdım, stolun ayağı yerə dəydi. Onu da yazdıq. "Ya"da də stol hərəkətə gəldi və "mim"də da

hərəkət etdi. Bildik ki, ruhun adı "Səlim"dir. Sonra yerinin adını soruşdum. "Nun", "cim" və "fa" hərflərində stolun ayağı hərəkətə gəldi. Başa düşdük ki, ruhun şəhərinin adı "Nəcəf"dir. Beləliklə, məqsədim nə idisə o ruhdan soruşdum və stolun ayağı hərəkətə gəldikdə hərfləri yazdım. Elə ki, məqsədim tamam oldu, hərfləri cəmləyib tərkibləşdirdim. Düzəlişdirib məqsədimi (cavabı) bildim. Onu bilmək lazımdır ki, ola bilsin ki, hərflər əvvəldə, yaxud da axırda gəlsin. Lakin əməl sahibi hərfləri düzməkdə mahir olmalı, əvvəlinci, axırıncı hərfləri tərkib düzəldən vaxt düzgün yerində yazmalıdır. Məsələn, ruh stolu hərəkətə gətirdi ki, filan qaçqın, ya səfərdə olan Tehran şəhərindədir. Əvvəlcə "əlef" məlum olacaq, ikinci "ra", üçüncü "ta", dördüncü "nun", beşinci "ha". Beləliklə, bu hərfləri düzdükdə "Tehran" alınır. Hamı bu qaydanı yadında saxlamalıdır.

Bunu da bilmək lazımdır ki, stolun ayağı torpaq, dəvə yunundan toxunmuş keçə, yunu çox olan qalın palaz üzərində olmamalıdır. O, mismarla yerə çalınmış möhkəm taxta üzərində qoyulmalıdır və həmin taxta tərpənməməlidir. O taxtanın üstündə nazik palaz, yaxud kilim olsa, çox dəqiq olar və onun eybi yoxdur. Ruhla söhbətdə olan zaman o şəxslər əllərini stolun üstündən çəkməməli və tərpətməməlidirlər. Birinci şəxs ağzıyumulu, sakit oturmalı, ikinci şəxs ruhla söhbət etməli və üçüncü şəxs ayrıca yerdə oturub söhbət edənin dediyi hərfləri yazmalıdır. Bu əməl təcrübədən keçirilmişdir. Bəndə həmişə pak ruhlarla söhbət edir.

Bu əməli həyata keçirən ağıllı adam təmiz olmalı, əhvalatları danışmamalı, qeyri-münasib suallar etməməlidir. Yoxsa, həlak olmaq qorxusu var.

*Nəvvab Mir Möhsün bin Hacı Ağamirzadə, 1301*

## NƏVVABIN RUHLARLA SUAL-CAVABI

Mərhum şah Sədinin ruhu bəndənin sualına belə cavab verdi ki, xan otağında bir dəfinə var ki, qiymətli xəzinədən ibarətdir və bu, daşın altında gizlədilmişdir. Tikililərdən o daşa qədər 80 addım, sudan ora 200 addım və daşdan yüz addım məsafə var. Xanın evinin şimalındadır. Hər kəs tapsa, məni yaddan çıxarmasın.

*Nəvvab*



Rindi-Nişaburi və bakılı Nəriman Rüstəm oğlunun ruhları ilə ayrı-ayrılıqda danışıb sual etdim. Allah onların hər ikisinə rəhmət etsin. Onların cavabı bu oldu ki, dağın kəməndində böyük daşın altında bir xəzinə basdırılmışdır. Bu yer çaydan səksən (zər) metr, imarətdən 50 (zər) metr məsafədə yerləşmişdir. İnşallah, görən Allah kimə qismət edəcək. Biz dua iltimas edirik.

*Nəvvab*

**Əlavə.** Bakılı Nağı Məhəmmədcəfər oğlunun (Allah rəhmət eləsin) ruhu buyurur ki, dağın kəməndində böyük ağ daşın altında bir xəzinə basdırılmışdır. Tikililərdən ora qədər 5 zər, çaydan dəfinəyə qədər 100 zər məsafə var.

İmarət və daşın şərqində bir zər dərinlikdə qızıl və cavahiratla dolu 5 güyüm basdırılmışdır. Onların hamısının qiyməti 100000 manatdır. Allah-taala görək nə edəcək.

**Əlavə.** Həmin mərhum şəxs, yəni, Nağı Məhəmmədcəfər oğlu buyurur ki, təpənin üstündə bitən əzgil ağacının altında gümüşlə dolu bir neçə qab gizlədilib. Bu təpə imarətdən 50 zər və çaydan 200 zər məsafədə yerləşir. Gümüşlərin qiyməti 50000 manat olar. Bu təpə dağın və tikilinin məğribində yerləşir.

**Əlavə.** Mərhum Şeyx Bəhayi (ruhu xurma dolu) bəndənin sualına belə cavab verdi ki, kiçik ağ daşın altında beş ədəd qızıl və cavahiratla dolu güyümdən ibarət xəzinə basdırılmışdır. Bu xəzinənin qiyməti yüz min manat olar. Böyük çaydan o dəfinəyə qədər yüz zər olar. Dəfinə tövlənin aşağısında, sağ tərəfindədir. Tövlədən dəfinəyə qədər 20 zər olar. Dəfinə kəmənddə torpağın 1 zər dərinliyindədir.

Yenə də Şeyx həzrətpənah, yəni, Şeyx Bəhayi bəndənin sualına belə cavab verdi ki, dağın və tikililərin məğribində yerləşən təpədə gümüş dəfinəsi var. Onun qiyməti 50 min manat olar. Bu dəfinə 1,5 zər dərinlikdə, əzgil ağacının dibində torpağa basdırılıb. Çaydan o təpəyə qədər 200 zər məsafə var.

Və əlavə yenə də bakılı Nəriman Rüstəm oğlundan soruşdum ki, harda xəzinə var? – O cavab verdi ki, evin kəməndində. Sudan ora qədər 80 zər olar və onun qiblə tərəfində böyük bir daş var.

Əlavə. Kazım Nəcəfi Əhmədullanın ruhundan sual etdim ki, həzrət Musanın anasının adı nədir? Dedi ki, Əmm Musa. Dedim ki, bu Quranda olan addır, bəs əsil adı nədir? Dedi ki, Əndulla. Sonra soruşdum ki, ən yaxşı həqiqi məzhəb hansı məzhəbdir? Buyurdu ki, islam.

## XƏZİNƏ TAPMAQ ÜSULU

Təcrübə aparanlar söyləyirlər ki, bir ovuc xardala Quranın ayəsini oxuyub, sonra yüz iki dəfə "ya möbin" söyləyib, onu xəzinə gizlədildiyi güman edilən otağa səpib, bir gecə-gündüz qapılarını bağlamalı. Bir sutkadan sonra qapını açıb içəri baxdıqda görünəcək ki, xardallar xəzinə olan yerin üzərində cəmləşiblər.

## ŞƏRABI SUDAN AYIRMAQ ÜSULU

Qatışıq şərabı sudan ayırmaq istəyirsinizsə, bir qab şərab və bir qab da suyu qarışdırıb başqa bir qaba töküb, onu bir yerə qoyun. Sonra boş bir qabı dörd barmaq qərarı ondan aşağıya qoyub, təhləbdən fitil düzəldərək bir tərəfini dolu, digər tərəfini isə boş qaba qoymalı. Beləliklə, fitil vasitəsi ilə su şərabdan ayrılıb boş qaba süzüləcək və birinci qabda xalis şərab qalacaq. Amma yaxşı olar ki, bu işlərdən iraq olasan.

## YUMURTANI ŞÜŞƏYƏ DAXİL ETMƏK ÜSULU

Təzə yumurtanı yumşalana qədər çox tünd sirkəyə qoyub saxlamalı. Sonra yumşalmış yumurtanı ehtiyatla boğazı dar olan şüşə qaba elə salmaq lazımdır ki, dağılmasın. Elə ki, yumurta şüşənin daxilində yerləşdi, o saat onun üstünə şirin soyuq su tökün və bununla da yumurta əvvəlki vəziyyətinə gələcək, onun qabığı bərkiyəcək və şüşədən çıxmayacaq. Bunu görən hər bir kəs təəccüb edəcək.

Söyləyirlər ki, hətta külə belə dəyməmiş olan lap təzə yumurtanın suda həll olunmuş hind zacı ilə istənilən hər hansı bir xətt və ya üstünə rəsm çəkib günəşin altında, yaxud da odda qurudub, yenə onun üstündən təkrar yazıb, yenə qurutduqdan sonra (ümumiyyətlə, nə qədər çox təkrar olunsa, bir o qədər yaxşı alınar) yumurtanı qaynadıb qabığını soyduqda belə, nəqşlər, yazıların yumurtanın ağında əks olunduğunu görəcəyik və onu yuduqda belə, getməyəcək.

Yumurta əhəngini (qabığını) sirkədə həll edib, onunla hər hansı bir rəsm çəkdikdə heç vaxt pozulmaz.



## ALƏTSİZ SÜMÜK KƏSMƏK ÜSULU

Söyləyirlər ki, qətən kəndirini ılıq suda isladıb, torpağa bulaşdırıb, bir neçə dəfə çəkdikdə nazik kəndir sümüyü kəsir.

## KAĞIZ YAZMAQ ÜSULU

Naşatır və süddə ağ kağızı yazıb qurutduqda orda yazılan heç bir hərf görünmür. Onu oda tutub bir az qızdırdıqda qara xətt aşkar olur.

Əgər soğan suyu ilə yazılsa, yazı yaşıl rəngdə olar. Söyləyirlər ki, buz suyu ilə yazdıqda yazı qırmızı olur. Bu mənə məlum deyil, təcrübə etməmişəm.

## KİŞİLİK QÜDRƏTİNİ ARTIRMAQ ÜSULU

Söyləyirlər ki, bişmiş yumurtanı duzsuz pendirlə əzərək qarışdırıb bir neçə dəfə zəkərə sürtdükdə çox güclənir.

Zəlini zeytun yağında bişirib kişilik əzasına sürtsən, onu son dərəcə gücləndirər.

Söyləyirlər ki, yarım dirhəm burəni balda qızardıb bir dirəm balzam yağı, yarım dirhəm tibet müşkünü də balda qızardaraq hacət vaxtı kişilik cinsinə sürtüb arxasını da onunla yağlasan, o, cinsi əlaqə vaxtı on nəfərlə görüşməyə qadir olar. Əgər qadın onu özünə sürtsə, o da şəhvətə gələr və qoca kişidən qaçmaz.

Söyləyirlər ki, səhra süddüyənini və hind şitərəcini yasəmən yağında, yaxud xalis balzam yağında qızardıb yarım qram zəkərə yaxdıqda qüvvətlənər (təcrübədən keçirilmişdir).

Söyləyirlər ki, iki danq Çin kəbabəsini bal və zəncəfillə qarışdırıb zəkərə sürtərək cinsi əlaqəyə girdikdə, hər iki tərəf çox ləzzət alar.

Söyləyirlər ki, bir danq səqmuniyəni gül yağı ilə qarışdırıb zəkərə sürtərək cinsi əlaqəyə girdikdə çox yaxşı olar.

Söyləyirlər ki, nərgiz soğanı, aqirqərha və mövizci yumşaq döyüb bişirdikdən sonra inək südü ilə kişilik cinsinə sürtdükdə, onu bərk, möhkəm edir, onu soyuq su ilə yumasan yatmaz. Əgər qadınlar bunu fərcinə, yaxud arxalarına sürtsələr, şəhvətdən doymazlar.

Aqirqərha və mövizci yaxşı əzib bal ilə qarışdıraraq cinsi əlaqəyə girməzdən bir saat əvvəl zəkərə sürtərək əlaqə vaxtı dəsmalla təmizləyib mübaşirət etdikdə qadına hədsiz ləzzət bəxş edər, kişiyə də həmçinin.

Söyləyirlər ki, qadının məhəbbəti üçün səqmuniyəni balla qarışdırıb, kişilik alətinə sürtərək cinsi əlaqəyə girdikdə, çox ləzzət edər.

Söyləyirlər ki, qarğanın ödünü parçaya büküb, buda bağladıqda istənilən qədər cinsi əlaqədə olmaq olar (təcrübə olunmuşdur).

Yarasa beynini təzə vaxtı 100 yaşlı qoca kişinin belə, ayağının altına sürtdükdə, əzası hala gələr.

Söyləyirlər ki, soxulcanı yuyub, təmizləyib, qurutduqdan sonra döyüb küncüd yağı ilə özünə yaxan kişinin cinsi aləti çox böyüyər. Amma əvvəlcə aləti qızaranacan ovub, sonra həmin tərkibi sürtmək lazımdır.

Söyləyirlər ki, küncüd gülünü bir kəsin sperması ilə qarışdırıb, bir az şirni ilə qadınlara versələr, sevgidə o dərəcəyə çatarlar ki, qərar tuta bilməzlər.

Deyildiyinə görə, kişinin orta barmağından bir damcı qan, ağzının suyundan və bir az da alnının tərindən şirniyə qarışdırıb qadına yedirtsələr, məhəbbətdə qərarsız olar.

Buyurulur və təcrübədən keçirilmişdir ki, toyuq yumurtasını deşib onun ağını xaric edib, ora sperma əlavə edib, ağzını bağlayaraq 40 gün at peyininin içərisində basdırmaq lazımdır ki, yetişsin. Sonra onu qurudub, şəkərlə qarışdırıb, qadına yedirtdikdə elə məhəbbət yaradar ki, onun bərabəri olmaz.

Məryəm ağacını nanə suyunda sürtüb, həb düzəldərək ondan bir danq hər hansı bir qadın içsə, bir il şəhvətdən düşməz. İki danq ona iki il təsir edər.

Canavarın cinsiyyət üzvünü ya günəş doğmazdan əvvəl, yaxud da gün batandan sonra kölgədə qurudub, hər hansı qadına versən və qadın ondan yesə, kişiyə nifrət edər.

Söyləyirlər ki, bir hissə reyhanı yarım hissə naşatırda qaynadıb, onun suyundan istinca etsə, cinsi əlaqəyə girmək istəyər.

10 ədəd məqbərə qarışqasını süsən və zeytun yağı ilə qarışdırıb, üç həftə günün altında saxladıqdan sonra onu cinsiyyət üzvünə və ya onun ətrafına sürtdükdə onun hərəkətə gəlməsinə, möhkəmlənməsinə və böyüməsinə səbəb olar (təcrübədən keçib).



## MÜALİCƏ ÜSULLARI

**Biləyin, kişilik üzvünün uzadılması.** Bunun üçün təzə sarımsaqla onu qızarana qədər ovmaq lazımdır. Sonra bu davanı ona sürtüb bir sutkadan sonra isti su ilə yumaq lazımdır. Bir daha əvvəlki kimi ovduqdan sonra soxulcanı təmizləyib qurulayaraq yarım qram küncüd yağı ilə həmin yerə sürtmək lazımdır. Sonra zəlini qurudub nərcis suyu ilə həmin əzanı ovxalamaq və sürtmək lazımdır. Bu əməliyyat təcrübədən keçirilmişdir və əzanı uzatmaq üçün heç bir başqa dərman onun qədər faydalı deyil. Əgər nərcisdə su olmazsa, qənd və südü ona əlavə edib göstərildiyi kimi əməliyyat aparılır. Ondan sonra yağ sürtmək və sonra yüngül ovxalamaq əməliyyatını bir müddət təkrar etmək, o üzvün uzanmasına səbəb olar.

**Saç və saqqal tökülməsi və tük bitməsi, onları siyah (qara) etmək üsulları.** Zəlini şüşəyə salıb üstünə sirkə töküb peyinə basdırmaq lazımdır. 40 gündən sonra çıxarıb ağ tükləri qırxaraq dərmanı ora sürtmək lazımdır ki, ağ tük çıxmasın.

Bir saat ərzində tükü qaraltmaq üçün murdar daşı və su görməmiş əhəngi eyni çəki və ölçüdə götürüb, yaxşı qarışdırıb çini qaba tökdükdən sonra həmin qaba maddələrdən dörd barmaq yuxarı qalxana qədər su töküb saça sürtürlər və ağ tükü qaraldana qədər gözləyirlər. Sonra onun saf suyunu şüşəyə yığıb qalanını tullayırlar. Əgər xəzzab etmək istəyirlərsə, iki hissə həna, bir hissə vəsməyə əczа islanana qədər o sudan töküb, bir saat dəsmalla bağlayırlar. Sonra açıb (saçı) yuyur və yasəmən yağı vururlar.

Kaftar peyinini yandıraraq zeytun yağı ilə qarışdırıb tükü getmiş yerə sürtdükdə orda tük çıxar.

Cilinus söyləyir ki, tükün tökülməsinin qarşısını almaq və tük xəstəliyini müalicə etmək üçün sarımsağın qabığını yandırıb, onu yağla qarışdırdıqdan sonra tük getmiş yerə sürtdükdə orda yenidən tük əmələ gələr. Bu, adamın özünə də qəribə gələcək.

Burəni və naşatırı yandırıb köhnə sirkə ilə üç gün başına sürtsən, üç saata tükü cücərdər (təcrübə olunub).

**Tük bitmənin qarşısının alınması üsulları.** Tükü qırxdıqdan sonra ağac qətranını zeytun yağı ilə qarışdırıb qırxılmış yerə sürtdükdə ordan əsla tük çıxmaz (təcrübədən keçirmişlər).

Qoyun beynini əhənglə qarışdırıb qırxılmış yerə sürtdükdə orda bir daha tük bitməz.

Yarasanın qanı, beyni və ciyəri də tükbitmənin qarşısını alır.

**Ləğvə xəstəliyi.** Bu xəstəliyi müalicə etmək üçün 5 qram badam içi, iki qram göyərti, 5 qram əsarunu döyüb bişirdikdən sonra 5 gün dalbadal ağızda saxlamaq lazımdır. Bu müddət ərzində turşu, qatıq və göyərtidən pəhriz saxlanılmalıdır.

**Qulaq ağrısı.** Sarımsaq suyunu qoyunun ödü ilə qaynadıb, qulağa damızdırdıqda ağrını sakitləşdirir və uğultunu götürür.

Əgər qulaq ağrıyarsa, keşniş suyunu sirkə ilə qarışdırıb qarqara etdikdə sağalar.

Uşağın qulağı ağrıdıqda ona isti kül tökülsə, şəfa tapar və türklərin "tabaq" adlandırdıqları sarı alağı döyüb, suyunu qulağa damcılatdırdıqda çox faydalı olar.

Qulağa soyuq dəyməsini və qulaq ağrısını müalicə etmək üçün ağ soğanı lay-lay doğrayıb, arasına bir az qara neft tökməli. Sonra xamırı lavaş kimi yayıb onun üstünə çəkərək, odun altına qoymalı, bir müddətdən sonra çıxarıb, onu iki yerə bölərək hər bir yarısını bir qulağın üstünə qoymalı. O, qulaqdan çirki çıxarıb ağrını sakitləşdirəcək.

Körpənin qulağı ağrıyırsa, xam şəkəri göy kağıza bükü̈b onun qulağına qoyduqda ağrı azalar və çirk xaric olar.

Şaftalı çiçəyini döyüb qulağın qurd düşmüş yarasına tökdükdə sağalar.

**Başağrısı.** Kasnı toxumunu döyüb gülabla alına qoyduqda başağrısı aradan qaldırılar (təcrübədən keçib).

Tünd sirkə və narınc qabığı ilə başa sürtdükdə şəfa tapar.

**Baş yeli (qıjıltısı).** Xardalı döyərək xam balın içinə töküb bir sutkadan sonra günün altında başa sürtdükdə, Allahın qüdrəti ilə sağalar.

**Çiçəkdöymə xəstəliyi.** Çiçəkdöymənin yerini yox etmək üçün nilufərlə həmin yeri sürtmək lazımdır.

Çiçəkdöyməni xaric etmək üçün siçanı tutub qarnını yararaq yaranın üstünə sarıdıqda, onu maqnit kimi çəkib xaricə çıxarır (sınanmışdır).

Eynən xoruz da bu xüsusiyyətə malikdir. Onu da yarıb yaraya qoyduqda onu çəkib təmizləyir.



**Öskürək.** Bişmiş qarğıdalını acqarına yedikdə öskürəyi kəsər. Öskürək quru olduqda ağ qənd (şəkər), iki sarımsaq, 5 qram zəncəfili bir-birinə qarışdırıb sübh tezdən və gecə vaxtı bir az yeyilsə, boğazdan qan gəlsə belə, sağalar.

Sokrat buyurub ki, səbusu köhnə sirkə ilə qarışdırıb gün altında qurutduqdan sonra başı adyala bürüyüb, onun tüstüsünə verdikdə köhnə zöhkəm sağalar.

**Göbək ağrısı.** Qarğa yumurtasını bişirib bal ilə qızardaraq acqarına yedikdə, göbək ağrısı aradan qalxar.

**Qulunc ağrısı.** Qarışqa yumurtasını döyüb səməd yağı ilə qarışdırıb bir az yemək və qalanını da ağrıyan yerə sürtdükdə qulunc dəf olar, başağrısı, gicgah ağrısı sağalar, qarından qan açılmasını da dayandırar.

**Qanlı ishal.** Hər gün bir dirhəm (qram) şahtərə toxumunu qovurub yesən, qanlı ishal müalicə olunar.

Qurd dərisini ətrafına dolayıb, altında bir az tüstü qaladıqda qarından gələn qanın qarşısı alınar.

Əgər bir kəs məcaməti[1] edərsə, ondan xilas olduqdan sonra su içməməlidir. Çünki o yenidən xəstələnər, qarnından qan açılar. Ona görə də su içmək olmaz.

**Sidik kisəsi xəstəliyi.** Əgər bir kəsin sidik kisəsində qum olarsa və öz-özünə tökülməzsə, qara noxudu suda qaynadıb acı badam yağına qatıb xəstəyə verdikdə sağalar (sınanmışdır).

Kişilik cinsində qan gələn şəxs ravənd yedikdə dərhal sağalar (təcrübədən keçib).

Sidik kisəsində şiş (iltihab) olduqda reyhanı döyüb, onu su ilə qarışdırıb içdikdə dərhal ağrı azalar, xəstəlik sağalar və şiş yatar.

Sidik kisəsi şişdikdə furunu keşniş suyu ilə qarışdırıb (içdikdə) sağalar.

Sidik kisəsində daş olduqda kərəviz toxumunu balla qarışdırıb içdikdə daş xaric olunur (təcrübə edilib).

**Karlıq.** Burəni tünd sirkədə həll edib süzdükdən sonra üç damcı qulağa damızdırdıqda onillik də olsa, karlıq aradan götürülər.

[1] Məcamət – cinsi əlaqədə olmaq

**Göz xəstəliyi.** Göz qızarıb ağrıyaraq geyişdikdə, keşniş suyunu gülabla qarışdırıb ona çəkdikdə geyişmə dayanar (dəfələrlə təcrübədən keçib).

Tiryəki zəylə qaynadıb qurutduqdan sonra onun üstünə bir az abqora töküb gözün altına və üstünə sürtdükdə, ağrı sakitləşir.

Dəfələrlə təcrübədən keçirilmişdir ki, qara minik heyvanının öd kisəsini və kirpi gözünü odun üstə qoyaraq münasib bir şeylə gözə çəkdikdə, görmə qabiliyyəti o qədər artar ki, əşyaları gecələr gündüz kimi görmək olar.

Göz ağrısı üçün bir qədər mum götürüb qoynunda isitdikdən sonra gözün üstünə bağlamaq lazımdır.

**Diş ağrısı.** Kəklikotunu qəlyanda çəkdikdə Allahın qüdrəti ilə diş ağrısı keçər.

Diş çıxaran kəs çətinlik çəkdikdə dişinin üstünü bir qədər açıb, zəfəran və tiryəklə xaricdən dişə sürtdükdə, yaxşı olar.

Əgər bir kəsin üz-başında çoxlu nuzlası olsa, dişinin dibi ağrısa, dişi dəvənin sidiyini üç dəfə ağzına alıb, bir az saxlasa, sağalar və ömründə bir daha nuzla görməz.

İki qram sədəf və iki qram ağ turp toxumunu döyüb, gecə saralmış dişin üstünə səpib səhəri misvakla yuduqda həm dişin dibi bərkiyər, həm də dişlər ağarar.

**Bəvasir.** 7 misqal zəncəfil yedikdə, Allahın əmri ilə sağalar.

**Yanğı ağrısı.** Yanğı xəstəliyini müalicə üçün həkim buyurub ki, hər gün bir misqal kadrel yemək lazımdır.

Söyləyirlər ki, bir az zirinci quyruq yağı ilə həll edib, yanığa vurduqda sağalar.

**Dəmrov.** Bir neçə hili döyüb tiryəklə qarışdırdıqdan sonra dəmrovun üstünə sürtdükdə, xəstəlik sağalar.

**Kəpənək qurdu müalicəsi.** Söyləyirlər ki, bir şəxsin qarnında kəpənək qurdu olarsa, beş ağacdan turş nar dərib (təzə dərilmiş olsa, daha yaxşıdır) toz-torpağını yuyub, qabığını bıçaqla soyurlar. Bir girvənkə çəkisində qabığı mis qaba qoyub 3-4 stəkan suda qaynadırlar. Bu əməliyyat qabda 1 stəkan həcmində su qalana qədər davam etdirilir. Sonra həmin maye parçanın arasına tökülüb sıxılır və süzülərək saflaşdırılır. Saflaşdırılmış su içilir. Ancaq içilən vaxt ürəkqalxma baş verəcək. Elə etmək lazımdır ki, (xəstə) qusmasın. Əgər



bunu bacarmasalar, o şəxsin qollarını kəndirlə möhkəm bağlasınlar ki, öyümə ötüşsün və mədədə olan dərman bir daha öyüməklə xaric olunmasın. Bir neçə saatdan sonra xəstənin əhvalı dəyişəcək və bir neçə dəfədən sonra yumaq boyda kəpənək qurdu xaric olunacaq. (Söyləyirlər ki, təcrübədən keçib).

## TƏRƏVƏZ İLƏ MÜALİCƏ ÜSULU

**Turp.** Qara turp çoxunun gözündə xar olub. Çox adamın onun faydasından xəbəri yoxdur. Həkim Cilinus söyləyir ki, acqarına turp yemək bəlğəmin qarşısını alır, mədəni gücləndirir, qanı saflaşdırır, ağız qoxusunu aradan qaldırır... Həkim Sokrat buyurur ki, əgər bir kəs turp toxumunu qoyun südündə bişirib yesə, sidik kisəsindəki qumu təmizlənər, bədəninin damarları genişlənər.

Səsi tutulan kəs turp toxumu ilə ağzını qarqara etsə, sağalar və səsi açılar.

**Sarımsaq.** Həkimlər sarımsaq haqqında da bir çox tərifləər söyləyirlər. Bu sahədə Cilinus hamıdan yaxşı təcrübə aparmışdır. Onu böyük tiryəkə bənzədir. Sarımsaq yeyən şəxsi ilan, əqrəb çalmaz və çalan heyvanlar, həşəratlar ondan qaçar. Bir kəsi ilan, yaxud əqrəb çaldıqda bir sarımsağı ikiyə bölüb həmin yerə sarıdıqda dərhal ağrı sakitləşər.

Nuzladan diş ağrıdıqda bir ədəd sarımsağı odda qızardıb (bişirib – *R.K.*), dişin üstünə qoyduqda, Allahın qüdrəti ilə ağrı sakitləşir.

Birisinin qulağı ağrıdıqda qoyun ödünü suda qaynadıb, iki ədəd sarımsağı ora əlavə edərək qulağa damcılatdıqda, ağrı sakitləşər, tutulmuş olsa açılar.

Sidik kisəsi şişdikdə, yaxud da ağrıdıqda bir az keçi yağını on iki ədəd qabığı soyulmuş qara şahani qaba töküb, iki-üç sarımsaq əlavə edərək qızartmalı.

**Soğan.** Cilinus söyləyir ki, heyzi bağlanmış qadını açmaq üçün bir qram (dirhəm) kəvər soğanını bir qram balla qarışdırıb içdikdə, dərhal qanı açılar (təcrübədən keçirilmişdir).

## İNAMLAR

Söyləyirlər ki, körpənin ilkin dişini torpağa düşməyə qoymayıb, qadın ipə bağlayıb boynundan asaraq özündə gəzdirərsə, hamilə olar.

Söyləyirlər ki, heyz görmüş qadın öz övrətini buluda açıb göstərsə, göy gurultusu kəsilər.

Əgər bağ əkilərkən (salınarkən) ordan heyz görmüş qadın keçərsə, o bağın meyvələri qurdlu və acı olar.

Heyz görmüş qadın güzgüyə baxarsa, qaralar.

Əgər heyz görmüş qadın qoyunlara çobanlıq etsə, qurd həmin qoyunlara yaxınlaşmaz, ona görə ki, qarın ağrısı tutar.

Əgər qızdırması olan şəxs qüsuldan əvvəl heyz görmüş qadının köynəyini geysə, qızdırması yox olar.

Heyz görmüş qadın epilepsiyası olan adamı ovarsa, onun gicəllənməsi azalar.

Hamiləlik vəziyyəti çox çəkən qadına – doğursan, doğ, yoxsa səni dəvəyə bağlayıb biyabana boşlayacağıq – dedikdə, dərhal doğar.

Sirlər kitabından məlumdur ki, dovşanın beynini şərabla yeyən qadında qeyrət olmaz.

Buyururlar ki, canavar gözünü kölgədə qurudub gözə çəkdikdə ruhi (şadlıq) bəxş edir.

Təmizlənmiş talkı şəbbimanı sirkə və yumurta ağı ilə qarışdırıb ağrıyan yerə vurduqda sağalar.

Təsdiq olunmuşdur ki, sarımsağı təmizləyib iynə ilə deşiklədikdən sonra hamilə qadına göstərdikdə əgər o, gecənin səhəri onun ağzından sarımsaq qoxusu gələrsə, deməli, o bakirə olmamışdır.

Söyləyirlər ki, qarışqa toxumunu yaşıl milçəyin beyni ilə əzib qarışdırdıqdan sonra onda bir mil yeyən adam cini görər.

Söyləyirlər ki, qara pişiyin ödünü və xoruz qanını kölgədə quruduqdan sonra onları qarışdırıb döyərək sürmə şəklinə salıb gözə çəkdikdə qəribə şeylər müşahidə olunur (cinlərdən, qeyb dünyasının işlərindən).

**Bakirəlik qanının xüsusiyyətləri.** Söyləyirlər ki, qızların bakirəlik qanını yetişməmiş qızların döşlərinə sürtdükdə (onun döşləri) böyüyər.

Adamın qanını suya qatıb həşərat dişləyən yerə sürtdükdə, ağrı azalar (sakitləşər).



Əgər bir kəs rəaf olsa və onun rəafı kəsilməzsə, rəafın sahibinin adını bir parça üzərinə qanla yazıb, onun qarşısına qoysalar, ona baxıb rəafı kəsilər.

**Yatmış adamın danışdırılması.** Söyləyirlər ki, əgər bayquş ürəyini bir parçaya büküb yatmış adamın sinəsi üstə qoysalar, Allahın köməkliyi ilə dilə gələr, ondan lazım olan nə soruşsan, onun cavabını söyləyər.

Əgər bir az canavar piyini əlin içində ovuşdurub, sonra onu yatmış adamın baldırına qoysalar, ondan nə sirr soruşsalar, cavab verəcək.

Söyləyirlər ki, qızıl quşun dilini bir parçaya büküb, yatmış adamın sinəsinə qoyduqda ondan nə soruşsalar, cavab verər. Bu iş xüsusilə qadınlar üçündür ki, onların sinələrinə qoyub nə soruşsalar, gizlətməsin.

Pişik yatmış yerdən torpaq götürüb yatan adamın üstünə səpdikdə, yatan adam öz ürək sirrini söyləyər.

Cəfəri Tusidən məlumdur ki, yaşıl qurbağanın dilini yatdığı zaman qadının ürəyinin üstünə qoysan, yaxud da qurbağanın bir hissəsi ilə onun yatağını buxur tüstüsünə versən, o qadın gündüz elədiklərinin hamısını danışar.

**Vəhşi heyvanların mütiləşdirilməsi.** Söyləyirlər ki, əgər qara pişiyin dilini ayaqqabının altında iki dərinin arasında yerləşdirib, sonra ayağa geyib çölə (biyabana) getdikdə, yırtıcı vəhşi heyvanlar ona hücum etməz.

Söyləyirlər ki, qara it dili də həmin təsirə malikdir. Onu da yuxarıdakı kimi iki dəri (gön) arasına qoysalar, itlər də o şəxsə hürməzlər.

**Toyuqların banlaması.** Uşaq vaxtı qədim kitablarda gözümə sataşdı və onları yazdım. Ancaq onların təcrübədən keçib-keçmədiyi mənə məlum deyil. Lakin qadın tayfaları bu gün də ondan istifadə edirlər.

Bazar günü – ev adamlarından birinin əcəli yaxınlaşıb.

Birinci gün – bu gün dövlət günüdür.

İkinci gün – bu gün övlada xoş xəbər olacaq.

Üçüncü gün – bu gün ər və arvad arasında dava olacaq.

Dördüncü gün – ev sahibinin bacarıq günüdür.

Beşinci gün – bu gün zəhmət günü deyil.

Altıncı gün – əgər toyuqlar bu gün banlasalar, deyirlər ki, ziyanlıq olacaq.

**Xoruzların vaxtsız banlaması.** Şənbə axşamı – bu gecədə deyirlər ki, əcəl yaxınlaşıb.

Bazar axşamı – bu, şadlıq gecəsidir.

Bazar ertəsi axşamı – bu gecə nə xeyir, nə də şər.

Çərşənbə axşamı – bu gecə övlad yaxşı olacaq.

Çərşənbə günü axşamı – bu gecə bacarıq gecəsidir.

Cümə axşamı – bu gecə zəhmət gecəsidir.

Cümə günü axşamı – bu gecəni söyləyirlər ki, xəstəlik gecəsidir.

## BAŞQA ÜSULLA MÜRƏKKƏB DÜZƏLTMƏK QAYDASI

Təmiz düyünü duzlu suda islatdıqdan sonra tavaya töküb yanana qədər qızartmalı. Sonra suda isladıb qaynatdıqdan sonra parçadan keçirməli (süzməli). Elə ki təmizləndi, təmiz suya töküb, yenidən qatılaşıb qır şəkli alana qədər qaynatdıqdan sonra tavaya his töküb xəmir etməli. Xəmir hisi tam götürüb bərkiyənə qədər onu qarışdırmalı və sonra çıxarıb qurutmalı. Beləliklə, mürəkkəb hazır olur.

## YAXŞI SABUN BİŞİRMƏK ÜSULU

Bir hissə qələvi və yarım hissə yaş söndürülmüş əhəngi bir qaba, yaxud da hovuza töküb onların beş misli qədəri suda iki saata qədər həll etməli. Həmin qabda, yaxud da hovuzda xüsusi deşik olmalıdır ki, qarışdırdıqdan, maddə çökdükdən sonra həmin deşiyin tıxacı çıxarılaraq onun təmiz suyu süzülür. Sonra ora təzə su tökərək onları yenidən qarışdırmaq lazımdır ki, onun tərkibində tündlük qalmasın. Süzülmüş suları ayrı-ayrı qablara yığıb, birinci suyun on misli qədəri zeytun yağını odun üstünə qoyaraq su ayrılana qədər və maye, xəmir şəklinə düşənə qədər qızdırmalı. Sonra xəmiri qurudub ya müəyyən ölçüdə kəsmək, yaxud da qəlibə tökmək lazımdır. Xəmirdə zeytun yağı əvəzinə quyruq yağı, küncüd yağı, gənəgərçək yağı və bunlara bənzər başqa yağlardan da istifadə etmək olar. Lakin bunların ən yaxşısı əvvəlincidir.



## KARTOFUN SAXLANMA QAYDASI

Ərəbcə "vərəmül ərz" adlanan kartofu bir neçə ay saxlamaq üçün onların böyüklərini və zədəsi olmayanlarını seçib təndirəbənzər bir çala qazaraq kartofu onun içərisinə töküb üstünü torpaqla basdırmaq lazımdır. Kartofu elə düzmək lazımdır ki, biri-birinə toxunmasın və çala dolana qədər bir lay kartof, bir lay torpaq tökmək lazımdır. Belə olduqda kartof 6-7 ay salamat qalır və çürümür. Mən özüm bunu təcrübə etmişəm. Ancaq o quyunun üstü açıq olmamalıdır, yağış onu islada bilər. Bu çala evin içində də ola bilər. Yaxşı olardı ki, belə quyu dalanda, yaxud da ona bənzər bir yerdə olsun.

## GÜLÜN VƏ BAŞQA BİTKİLƏRİN ƏTRİNİ ALMAQ ÜSULU

Bunun üçün onları bir şüşə qaba yığıb, üstünə su, yaxud da gülab tökürlər. Sonra qabiləyə (kolba) badam, zanbaq, zeytun, yaxud bunlara bənzər yağ əlavə edərək gülab almaq üsulu ilə odun üstünə qoyurlar. Həmin qabdan qabiləyə daxil olan su – gülab, üstünə çıxan yağ isə ətirdir. Yağın altında qalan suyu götürüb baxmaq, sonra isə ona gülab və yağ əlavə edərək əvvəlki üsulla əməliyyatı təkrar etmək lazımdır. Üçüncü dəfə həmin birinci suyu bir neçə dəfə, hətta 7-8 dəfə həmin yağla birlikdə qaba əlavə edib, zəif günün altına qoymaq lazımdır ki, onun suyu çəkilsin.

## QUYUDAN QAZI XARİC ETMƏK ÜSULU

Çoxlu qazı olan quyunu qazdan xilas etmək üçün onun içərisinə altı pud söndürülməmiş və rütubət çəkməmiş təzə əhəng töküb, onun ardınca quyuya 7-8 çaydaşı tullamaq lazımdır ki, əhəngi əzsin və suda həll etsin. Bu zaman əhəngin qazı quyuda olan başqa qazları da özü ilə bayıra çıxaracaq. Əməliyyatdan bir gecə sonra quyuya adam salıb daşları və əhəngi xaric etmək lazımdır. Quyuya girməzdən əvvəl böyük bir keçə parçasını quyuya sallayıb, 40 dəfə aşağı-yuxarı çəkmək lazımdır. Bundan sonra quyuda əsla qaz olmaz.

## HAVANIN DƏYİŞMƏSİNİ BİLMƏK QAYDASI

Söyləyirlər ki, havanın dəyişəcəyini bilmək üçün su ilə dolu şüşə qaba zəli buraxılır və əgər səhərçağı zəli suyun dibində oturarsa, deməli, hava yaxşı, suyun yuxarısında olarsa, havanın dəyişəcəyi və ola bilsin ki, yağış yağacağından xəbər verir.

7 ədəd yarasını qırmızı mis tasın altına qoyduqda, isti havanın soyuması və yağış yağmasına səbəb olacaq.

## BİR ŞEYİ PENDİRLƏ YAPIŞDIRMAQ, BİRLƏŞDİRMƏK ÜSULU

Bu üsulla birləşdirilən şeylər suyun və atəşin təsiri ilə dağılmır. Bunun üçün təzə pendiri vərəq şəklində doğrayıb, üzərinə su dəyməmiş əhəng səpib sığal daşın üstünə sərirlər və sonra həmin pendir vərəqlərinin üstü örtülənə qədər əhəng töküb onların üzərinə də daha bir sığal daş qoyub, 10 gün günün altına qoyurlar. Üstdəki daş çox ağır olmalıdır ki, altındakı maddəni elə sıxsın ki, onlar qarışıb həll olunsunlar. Sonra onu su ilə yuyub duz səpilmiş adyal, yaxud palazın üstünə qoyub bir həftə daşın altında saxlamaq lazımdır. Sonra onda qırmızılıq və yağ olarsa, təmizləyib günün altına qoyulur və bu zaman yenidən yağ və qırmızılıq əmələ gəlir. Sonra yenə də onu duzlu su əhənglə qaynadıb o dərəcəyə çatdırırlar ki, onda yağlılıq və qırmızılıq qalmır. Onun kamilliyi yağ və qırmızılığın olmamasındadır. Sonra onu sürmə kimi sürtüb şüşə qaba yığır və ehtiyac olduqda ondan bir az götürüb su və yumurta ağı ilə köpüklənənə qədər çalır və daşın üstünə damcıladaraq o dərəcəyə qədər sürtürlər ki, yuxarıdakı daş aşağıdakına yapışsın. Sonra əhəng suyu damcılarını saflaşdırıb bərabər (rəvan) olana qədər ona əlavə edirlər. Əhəng suyunun miqdarı o dərəcədə olmalıdır ki, onun üstünə bir şey qoyduqda qısa zamanda qurusun.

## QURĞUŞUN PASASI (ŞLAK) ƏMƏLİYYATI

Qurğuşunu əridib sülügən (surik), yaxud yanmış qurğuşunla qarışdırıb bir qaba tökdükdən sonra sirkə töküb, yaxşı yanmış və qarışmış hissəni ayırıb arpa ilə suya töküb qaynatmalı. O qədər ki, arpa qızarsın. Sonra onu arpadan ayırıb, onun çəkisində duz əlavə edib, hər gün qarışdırılır və hər üç gündən bir də suyu dəyişdirilir ki, tam təmizlənsin və xam hissə qalmasın. Sonra onu yuyub istifadə edirlər.



## QURĞUŞUN PASASINI AĞARTMAQ ÜSULU

Qurğuşun pasasını ağ yuna büküb türk paxlası ilə paxla qırmızı, yun isə qaralana qədər qaynatmalı. Qaydaya görə, həmin əməliyyatı yenidən təzələməklə qurğuşun pasası ağarmaq dərəcəsinə çatdırılır. Bundan qoltuq altından və başqa əzalardan gələn kəsif qoxunu yox etmək, tərləməyin və başqa təsirlərin qarşısını almaq üçün istifadə edilir.

## BİRLƏŞDİRMƏ ÜSULU

Məhlulun bir hissəsini uzun boğazlı kolbaya töküb, onun ağzına uyğun gələn sınıq şüşə parçası qoyub su doymamış əhəng, duz, sönmüş əhəng və yumurta ağı ilə suvamaq lazımdır. Sonra onu kül qazanına qoymalı. Ancaq kolbanın altındakı külün səviyyəsi dörd barmaqdan artıq olmamalıdır və onun ətrafında, eləcə də qazanın altında mülayim alov olmalıdır. Külün istiliyi o qədər olmalıdır ki, kolbanın boğazında məhlulun buxarı müşahidə olunsun. Elə ki tər (buxar) yox oldu, bu, birləşmə əlamətidir. Sonra şüşəni sındırdıqda qatı ekstratı xatırladan birləşmə müşahidə olunacaq. Onu çini qaba qoyub nazik bir şeylə üstünü örtərək günün altına qoymaq lazımdır ki, bir az da hava ilə birləşsin.

Torpaq üzərində yarım kuy ölçüsündə kürə şəklində yer qazılır. Sonra oranı isladıb divarları sığallanır ki, çala möhkəm olsun. Çalanın baş tərəfi torpaqdan bir qədər hündürdə olmalıdır ki, maddənin üzərində olan kəsafəti dəmir alətlə təmizləmək mümkün olsun. Sonra bir tərəfi geniş, digər tərəfi isə dar, ağzı açıq dəmir qıfı çalanın kənarına elə yerləşdirmək lazımdır ki, Ənbubənin nazik tərəfi onun ortasından hündürdə dayansın. Ənbubənin geniş tərəfinə isə iki ədəd dəmirçi dəmi qoyulur ki, fasiləsiz olaraq çalanın ortasından şiddətli hava axını olsun. Çalanın ətrafına quru söyüd

odunu düzüb odlanılır və elə edilir ki, şölə, çalanın xaricindən ona daxil olsun və çalada olan nə varsa hamısını əritsin. Ora gümüşü daxil edirlər. O, üç hissə olmalıdır. Bir hissə gümüşü əritmək üçün. Bu əvvəlcə artırılır və əridikdən, iki-üç dəfə tərpəndikdən sonra ikinci hissəni əlavə edirlər. Bir saatdan sonra bir az gözləmək lazımdır ki, tərpənsin və fırlanmağı dayansın. Sonra onun üzünün kəsafətin yox edir. Ərintinin sakitləşməsi onun təmizliyini və kəsafətin olmamasını göstərir. Qəmərin qurğuşunla əriməsi gümüş cövhərinin pis olması əlamətidir.

Tutiya kimi yuyulmuş səkkiz hissə bişmiş kərpic və iki hissə sarı kuporos götürüb onun saflığına od vasitəsi ilə əmin olduqdan sonra iki hissə çoxlu od görmüş təndir külü, dörd hissə baş yumaq üçün gül və dörd hissə xörək duzunu qarışdırıb, su ilə xəmirləşdirirlər. Həmin maddəni kuzənin yarısına qədər töküb qarışıq qızılı xırdalayıb o palçığa batırıb o palçıqdan bir az qızılın üzərinə töküb kuzənin ağzını tam şəkildə bağlayırıq. Kuzəni quruduqdan sonra götürüb dulusçu kürəsinə, yaxud da kərpic bişirilən kürəyə qoyuruq. Təmiz olmayan qızıl üzə çıxsa, onun rəngi və yumşaqlığı alınana qədər, eləcə də naqislik ordan qalxan və saflıq əldə olunana qədər təkrar etmək lazımdır.

Kolbaya barmaq qalınlığında mastika töküb, qatışıq qızılı xırdalayaraq onun üç çəkisində təsirli kislotanı da kolbaya əlavə etməli. Kolbanı kömür odunun üstünə qoyub ondan qalxan tüstü qaradan ağa çevrilənə kimi qaynatmaq lazımdır. Sonra onu qaba töküb, ona mis vərəqlər əlavə edirlər. O zaman qızıla qarışmış nə qədər gümüş varsa, onunla qarışıb kislotanın üstünə çıxacaq və misə çökəcək. Saf qızıl qabın dibinə çökəcək və ona qarışmış nə varsa, hamısından təmizlənəcək.

Bir-birinə qarışmış qızıl və gümüşü ayırmaq üçün dəmir kuporosunda iki hissə, bir hissə saf şoranı çox yumşaq şəkildə qarışdırıb kolbaya tökürlər, sonra ənbiq vasitəsi ilə su distilə edilir, ya da ki, mastikanı əvəz edən kül qazanı vasitəsi ilə distilə edilir. Sonra ənbiqdə olan suyun üçdə birini kolbaya əlavə edib, onu da distilə edirlər. Ənbiq əhəngə çevrildikdə təcrübə başa çatır.



## KÜKÜRD SUYUNUN ALINMASI

Əteyi enli çırağın altına çıraqdan və onun da altına ağzı böyük olan çini, yaxud adi bir qab qoyulur. Bu qabın ağzı qəndilin ağzından böyük olmalıdır. Amma çıraqdanla qabın arasına bir şey qoymaq lazımdır ki, qəndildən süzülən hər bir tər (buxar) çıraqdanı bulamasın. Çini, yaxud müzəzcec nəlbəkisini üzüqoylu qoymalı, yaxud da daş və qəndili elə asmaq lazımdır ki, bir tərəfi azca aşağıya meyilli olsun ki, tər yaxşı damcılasın (çırağı). Piy əvəzinə yaxşı fars kükürdü, yaxud şəffaf kükürd şöləsi qəndilin ortasında olmalıdır ki, qəndildən kənara çıxmasın və onu havadan (külək) yaxşı qorumaq lazımdır ki, xaricdən qəndilə daxil olmasın və əsla onu tərpətməsin. Əgər qəndil və şüşə bir-birinə çatmasa, çini kasanı da hazırlaya bilməyəcəksiniz. Əgər qəndil şöləyə tab gətirməyib çatlasa, onu xaricdən hikmət (palçığı) gili ilə tutmaq olar. Distillə olunmuş (ərp) qara rəngini ağa çevirmək üçün həmin distillə olunmuş maddəni kiçik bir kolbaya töküb onun üçdəbir, dörddəbir hissəsini qabın içərisinə qoyub, çox mülayim kül istisində distillə etməli.

## MÜXTƏLİF TÖVSİYƏ VƏ MƏLUMATLAR

Söyləyirlər ki, şüşəni toyuq, yaxud da göyərçin tükü ilə sıx doldurub ağzını mumla möhkəm bağlayaraq hündür bir yerdən atdıqda belə, sınmaz.

• Xalis mumdan iki ədəd içi boş olan quş müqəvvası düzəldib onlardan birini soda duzu ilə doldurub qarın nahiyəsi, göz və qulaqlarından deşik açmalı. İkinci müqəvvanı da sürtülüb yumşaldılmış təhləb ilə doldurmalı. Təhləb yaşıl ota deyilir ki, keçə kimi suyun üzü və kənarında bitir. Bu müqəvvanın da gözü və qulaqları deşilir. Bunların hər ikisi hovuza qoyulduqda içərisi duzla dolu olan müqəvva ağır olduğu üçün suya batır, lakin o birisi yüngül olduğu üçün suyun üzərində qalır. Bir saatdan sonra suyun dibinə çökmüş müqəvva duzun əriməsi nəticəsində boşalır və suyun üzünə qalxır. İçərisi təhləblə doldurulmuş digər müqəvva isə deşiklərdən rütubət çəkdiyi üçün ağırlaşır və suyun dibinə çökür. Bu müqəvvaların rəngləri müxtəlif, yəni biri yaşıl, digəri qırmızı, yaxud da başqa rəng olmalı və onların çəkiləri də dəqiq müəyyənləşdirilməlidir.

• Bir qab su və bir qab da şəbnəm (şeh) götürüb, onları qarışdıraraq şüşə qaba töküb, ondan iki qədəh doldurub, mərc qoşmaq lazımdır ki, bu iki qədəhin suyunu bir qədəhə elə yerləşdirəcəyik ki, bir damcı da yerə tökülməyəcək. Günəş doğanda və bir az qalxandan sonra qədəhlərin birini yavaş-yavaş, az-az digərinə tökürlər. Günəş şəbnəmi özünə cəlb etdiyi üçün o buxarlanır və yerdə xalis su qaldığı üçün bir qədəhə sığışır.

• Məhlul talkı ərəb kitrəsi ilə həll edərək yazıb qurutduqdan sonra möhür ilə sürtdükdə, onu gümüşdən seçmək olmur.

• Söyləyirlər ki, dürrü yonub altı gün ulaq sidiyində saxlasan, yaqut kimi olar və əgər ağ yaqutu dəvə sidiyində qaynatsan, qırmızı olar.

• Suyu dondurmaq istəyirsənsə, bir az qar gətirib mis qaba qoy və ona bir az yemək duzu qarışdır. Sonra başqa bir mis qaba yarısından su töküb, əvvəlki qar və duz qarışıq qabın içərisinə qoy. Bir az keçdikdən sonra görəcəksən ki, su buza çevrildi. Təcrübədən keçib.

• Evdə birə çox olduqda yatmazdan əvvəl bir neçə sarımsağı yarı bölüb yatağa tulladıqda, orda olan bütün birələr məhv olar.

• Söyləyirlər ki, paltarı əvvəlcə duzlu suda, bir gün sonra isə yumurta ağı ilə yuduqda oda tullasan belə yanmaz.

• Boranı toxumunu üç gün küncüd yağında saxladıqdan sonra əkdikdə ondan toxumsuz boranı əmələ gələcək.

• Lalə toxumunu döyüb, bal ilə məcun etdikdə ondan yeyən hər bir kəs bihuş olar.

• Ürəyiniz istədiyi miqdarda qönçəni şüşə, yaxud da saxsı qaba yığıb onların üstü örtülənə qədər xam bal tökərək ağzını bağlayırıq. Başqa bir mövsümdə çıxarıb üstünə isti su tökdükdə qönçələr açılır.

• Söyləyirlər ki, lax yumurta, şərab çöküntüsü və arpa ununun hərəsindən bir az bağırsağın içərisinə yığıb, balıq olan suya atdıqda bütün balıqlar ora yığışar və tora düşər.

• Acı badam çərdəyini qara mövizlə döyüb itə verdikdə bihuş olar. Onun qulağına iynə batırdıqda ayılar.

• Söyləyirlər ki, qırxayağın 44 ayağı olur. Hər tərəfdə 22 ayağı var və onun sancması çox ağrılı (yandırıcı) olur. O, sancdığı yerə duz və sirkə sürtdükdə ağrı kəsir.

• Bir danq şir nəcisini şərabda həll edib içdikdə, şəraba o qədər nifrət edəcəksiniz ki, bir daha ona meyil etməyəcəksiniz.

• Yağsız qoyun ətini parça-parça doğrayıb dağ alçasının tumuna (bərzalic) sürtüb onu kuzənin içinə qoyaraq qurd düşənə qədər at



peyinində basdırmalı. Sonra qurdları şüşəyə yığıb qurutmalı və istifadə zamanı ondan iki hissə və bir hissə də əfyun götürüb qarışdıraraq bir danq miqdarında kimsəyə sürtdükdə adam bihuş olur. Onu huşa gətirmək üçün isə bir neçə damcı sirkəni burnuna tökmək (kifayətdir).

• Yalnız xoruzun ikinci mədəsində tapılan həcərəldiki ağıza qoyduqda susuzluq yox olur. Onu içmək də susuzluğu və dəliliyi, vasvasılığı aradan qaldırır.

• Naşatırı həll edib, kağız üzərinə şəkil çəkib, yanına qoyduqda səhərdən-axşama qədər o şəxsə heç bir həşərat toxunmayacaq.

• Buğdanı qızmış dəvənin ağzının köpüyünə, yaxud onun tərinə bulayıb quşa verdikdə bihuş olar.

• Söyləyirlər ki, yaşıl sərçənin qanını xoruz boynunun dərisi ilə fitil edib və onun qanadlarına erat rəngi səpib, o dəriyə büküb, yaşıl çıraq qabına qoyub, yağla dolduraraq yandırdıqda o evin içərisində rəngarəng quşlar uçduğunu görəcəyik.

• Söyləyirlər ki, əgər yumurta yanığını döyüb, üyüdüb kətan torbaya səpib və bir az dovşan qığına sürtüb zanbaq yağı ilə qarışdırıb, ona əlavə etdikdən sonra onu büküb fitil düzəldərək zanbaq yağı ilə doldurulmuş çırağa ondan fitil salıb alışdırdıqda məclisdə olan qadınlar qeyri-ixtiyari olaraq rəqs etməyə və ayaqlarını yerə döyməyə başlayacaqlar. Bu hal yalnız qadınlara məxsusdur, kişilərə bir o qədər də təsir etməz (zarafat).

• Söyləyirlər ki, samebrəz, yəni kərtənkələni bir əsgiyə büküb, yağla doldurulmuş təzə çırağa salıb, alışdırıb məsxərəyə qoyulan adamın əlinə verdikdə qeyri-ixtiyari olaraq həmin adamdan səslər çıxacaq ki, o özünü saxlamağa qadir olmayacaq və bu da orda olanların gülüşünə səbəb olacaq.

• Qaşı rus gövhərindən olan üzüyü suya atdıqda batmaz. Bu şərtlə ki, üzüyün gümüşünün çəkisi 1,5 danqdan artıq və qaşı böyük olsun.

• Qaşı böyük daneşdən olan polad üzüyün qaşını azotla doldurub daşını gümüş, yaxud da başqa şeylə möhkəm bağlamaq lazımdır ki, (azot) onun altında qalsın. Bu üzüyü oda atdıqda oddan qaçdığı üçün bir yerdə dayanmayacaq.

• Söyləyirlər ki, əgər bir az naşatırı və aqirqəhratı möhkəm isladıb, qarışdırıb onun suyu ilə ağızı qarqara edib, içəri töküb, bir də təkrar edib, suyunu tökməyərək qarqara edib içəri tökdükdən sonra qızmış, yaxud qızarmış dəmiri ağıza qoysalar, yaxud yalasalar da, əsla ağız və dili yandırmaz.

• Söyləyirlər ki, məhlul talkı kafurla qarışdırıb xəmir etdikdən sonra, barmaqları iki-üç dəfə ona batırıb hər dəfə quruladıqdan sonra od vurduqda bütün barmaqlar çıraq kimi yanıb şölə saçacaq və barmaqlara heç bir zərər dəyməyəcək.

• Söyləyirlər ki, qoyunun dalağını qiymə edib, ona bir az qənd kirşanı əlavə edərək sonra qurudub, yumşaltdıqdan sonra ondan bir az su ilə dolu qaba töksələr, o su qan kimi olar.

• Söyləyirlər ki, hind arpası, yaxud da xiyar toxumunu qanalma neştəri ilə adamdan alınmış qana bulayıb, 7 gün günün altında saxlayıb, tam qurutduqdan sonra nazik kağıza büküb 7 gün də kölgədə qurutduqdan sonra təzə kətana büküb saxlayırsan. Sonra kəndlilər yer (əkərkən) sulayarkən onların belinə yapışmış palçığı götürüb qurudub saxlayırsan. Əməliyyat zamanı o torpağı yerə, yaxud da iri bir (tas) ləyənə töküb, seçilmiş toxumları onun içərisinə basdırırsan. Sonra həmin torpağa toxumlar islanıncaya qədər su töküb üstünü hindlilər kimi örtürsən. Məclis əhlini söhbətə tutub bir saatdan sonra onun üstün açdıqda görəcəklər ki, toxum cücərib yarpaqladı və gül açıb (çiçəkləyib), meyvə (bar) gətirdi. Bu, çox qəribə bir işdir.

• Söyləyirlər ki, zirinc və zəncarı bir parçaya bağlayıb, həll olunmuş yağla dolu çıraqda yandırdıqda orda olanların üzü sarı, dişi qara, qulağı yaşıl görsənəcək.

• Köhnə pambıqdan möhkəm fitil düzəldib onun üstünə bir az ağ sink boyası töküb çoxlu sürtürlər ki, onun hamısı fitilə hopsun. Sonra təzə zülal yağı töküb yandırırlar. Bu zaman onun işığında oturan adamların rəngi sarı, dişləri isə qara görünəcək.

• Əlhədid (dəmir) zəfəranını və dəmir yonqarını fitilə büküb zeytun yağı tökülmüş çıraqdanda yandırdıqda məclis əhli hər şeyi əksinə və düzü əyri görər.

• Bir az buz götürüb onun üzərində çala düzəldib, ora bir miqdar kafur əlavə edib od vurduqda, buz şam kimi yanar.

• Söyləyirlər ki, dovşanın qığını məclisdə tüstüləndirdikdə məclis əhli biixtiyar gülməyə başlayacaq.

• Söyləyirlər ki, səndərusu yumşaldıb, dəri parçasına büküb, ağıza qoyub, şamı yandırıb əldə tutaraq o səndərusu şamın atəşində yandırdıqda ondan çoxlu alov qalxacaq və o çatdığı yerə qədər yanacaq. Camaat elə biləcək ki, tökülür.



• Uzunboğazlı şüşəyə bir az tünd-ağ sirkə töküb bir az da burəni narın döyüb ora əlavə etdikdə o saat cuşa gələcək. Əgər bu zaman şüşə ələ alınarsa, yaxud buzun və qarın içərisinə qoyularsa, partlayar.

• Söyləyirlər ki, göyərçin yumurtasını deşib, içərisində olan maye sümürülüb çıxarıldıqdan sonra qabığı qurudub, həmin deşikdən yumurtanın içərisinə şəbnəm doldurub, deşiyi tutaraq hamamın istixanasına və ya ona bənzər yerə qoyduqda o saat həmin yumurta yuxarı qalxmağa meyil edəcək və özünü hamamın şüşə tavanına çatdıracaq. Yaxud da günəşin şüası düşən bacaya qoyduqda günəşin istiliyi nəticəsində həmin saat bacanın yolu ilə yuxarı qalxar ki, bu da təəccübə səbəb olacaq.

• Əgər ilan dərisindən fitil düzəldib evin künclərində yandırılsa, adama elə gələcək ki, ev ilanla doludur.

• Naşatırla ağıza və dilə sürtdükdən sonra ağıza od daxil etdikdə, onu yandırmaz.

• Köhnə xəstəliyi tez sağaltmaq üçün gözü açılmamış it küçüyünü mal peyinində yandırıb, onun yanığını əzib nasvərə qatıb çəkdirdikdə tez sağalar (təcrübədən keçib).

• Birisi tiryək çəkib ölüm ayağına düşdükdə üç qram qara istiotu əzib o şəxsin boğazına tökdükdə dərhal xilas olar, bu şərtlə ki, onun beş dırnağı göyərməmiş olsun.

• Nüğrüs xəstəliyini sağaltmaq üçün ora göbək yağı sürtmək lazımdır.

• Burundan çoxlu qan açıldıqda əvvəlcə müəyyənləşdirmək lazımdır ki, qan burunun hansı deşiyindən gəlir. Əgər qan burunun sağ deşiyindən gəlirsə, sol deşiyi və əgər sol deşikdən gəlirsə, burunun sağ deşiyini tutmaq lazımdır. Əgər kişi olsa, bir batman buzu döyüb dəsmalla onun başını sarıdıqda qanaxma dərhal dayanar (təcrübədən keçirilib).

• Qurd beynini suda qaynadıb şiş olan yerə sürtdükdə sağalar.

• Çuğundur yarpağını qaynadıb şişmiş (iltihablı) yerə qoyduqda dərhal şiş yatar və yox olar.

• Əgər bir kəs sürmə yemiş olsa, yaxud da ona sürmə verilmiş olsa, çəkisi yarım misqal olan üç naşatır həbini atıb onun üstündən də toyuq yumurtasının sarısını içərsə, səsi açılar.

• Qadın hamilə olmaq istəsə, bir az buya qozu (Hindistan cevizi – *R.K.*) və bir az da nar qabığını sürtüb bal ilə qarışdıraraq onları

qoyun yununa büküb özünə qoysa və üç gün oruc saxlayıb sonra halalı ilə görüşsə, Allahın əmri ilə hamilə olar (yoxlanılmışdır).

• Sümük ağrıdıqda ov quşunun, yaxud da sərdinin beynini hamamda ağrıyan yerə sürtdükdə çox fayda verər. Əgər yaxşı faruq tiryəki olsa, onu da sürtmək lazımdır ki, çox faydalıdır.

• Ağız və burundan qan gəldikdə kasnı toxumunu duzla ovub yedikdə çox tez sağalar.

• Acı yarpağı başa qoyduqda süzənək sağalar.

• Söyləyirlər ki, burundan qan açıldıqda və onu dayandırmaq mümkün olmadıqda, əgər qan burnunun sağ deşiyindən axarsa, sağ əlin çeçələ barmağını, sol deşikdən axdıqda isə sol əlin çeçələ barmağın birinci bənddən bükmək lazımdır ki, qanaxma kəssin.

• Bir kəsi it tutduqda onun qudurmuş olduğunu bilmək üçün bir az xəmiri it dişləyən yerə sürtüb, başqa itlərə tulladıqda əgər it həmin xəmiri yeyərsə, səni qudurmamış it, yeməsə, qudurmuş it tutub. Başqa üsul isə belədir ki, həmin xəmiri xoruza atdıqda yeyib ölərsə, deməli, it qudurub.

Bir kəsi qudurmuş it tutduqda o iti iki hissəyə bölüb arasından keçməli, onun tükünü yandırıb ondan həmin yerə qoymalıdır ki, onun ağrısı sakitləşsin.

• Söyləyirlər ki, bayquşu öldürdükdə əgər nəzərində tutsan ki, onun bir gözü açıq, digəri isə örtülü olacaq, onun örtülü gözünü hədəqədən çıxarıb bir parçaya büküb özünlə götürdükdə əsla yuxun gəlməz. Deyirlər ki, meymunun da belə xüsusiyyəti var.

• Gözdən tük çıxarsa və onu dəf etdikdən sonra bir də çıxarsa, onun əlacı budur ki, qara xoruzu gözünə çəksin. Bir daha gözündə tük bitməz.

• Söyləyirlər ki, buğdanı, yaxud başqa bir şeyi dağ alçasının tumuna və kükürdə bulaşdırıb quşa verdikdə, o bihuş olar.

• Əgər bir az küncüdü kükürd, yaxud zirinc suyunda qaynadıb, sonra qurudaraq hər hansı bir quşa verdikdə onu bihuş edir. Onun hülqumuna bir az küncüd, yaxud zeytun yağı tökdükdə ayılar.

• Söyləyirlər ki, keçi qığını qarışqa yuvasına tökdükdə onların hamısı qırılar.

• Söyləyirlər ki, çubuğu tülkü piyinə bulayıb, evdən kənarda qoyduqda o çöpün ətrafında olan bütün birələr ona daraşacaq. Donuz piyi də bu xüsusiyyətə malikdir.



• Dostluq üçün təcrübədən keçirmişlər ki, şanapipik caynağını öz əl və ayaq dırnaqlarıyla birlikdə qabda yandırıb, toz kimi əzib şərab, yaxud da şirni ilə hər kəsə versələr, onun mütisi olar.

• Cəfəri Tusi göstərir ki, üzün təzə tükünü qayçı ilə kəsib, buğda unu ilə qarışdırıb qadına yedirtdikdə o, məhəbbətdən biqərar olar.

• Ruhani tibb kitabından məlumdur ki, qadınların baş tükünü yandırıb, onun hisini su dəyməmiş kuzəyə verdikdə ondan su içən hər bir kişi o qadına o qədər nifrət edəcək ki, hətta ona belə, baxmayacaq.

• Evdə sapand fırlamaq təfriqəyə səbəb olar.

• Qadının çadrasına xəlvəti qırmızı soxulcan bağladıqda, o şəhvətə gələr.

• Məlumdur ki, daraqdan düşən saçı yandırıb, həmin qadınla əlaqəyə girən zaman o küldən istifadə etdikdə başqası o qadınla əlaqəyə girə bilməyəcək və s. qadın da heç vaxt həmin kişidən özgəsinə baxmayacaq.

• "Həyatül-heyvan"dan məlumdur ki, kişilik cinsini keçi dodağının qanına bulaşdırıb cinsi əlaqəyə girdikdə başqası o qadınla görüşməyə qadir olmayacaq və o qadın da başqaları ilə ünsiyyətə girməyəcək.

• "Əsraril-təba"dan məlumdur ki, əgər kişi cinsiyyət üzvünə canavar ödü sürtüb cinsi əlaqəyə girsə, heç bir kəs daha o qadına yaxınlıq edə bilməz. Deyilənə görə, kaftar ödü, uzunqanad quşun öd və qanı, qarğa qanı da həmin xüsusiyyətə malikdir.

• Qırmızı burəni sədəflə sürtüb qızın burnuna qoyduqda asqırarsa, bakirədir.

• Dəfələrlə təcrübədən keçirilmişdir ki, hamilə qadının əllərinin içi hamar və saf olarsa oğlu, yaşıla çalarsa qızı olacaq.

• Yaxud da ağırlıq (hamiləlik zamanı) sağ tərəfə düşərsə oğlu, sol tərəfə düşərsə qızı olacaq.

• Yetişmiş meyvəni qızılgül yağı ilə qarışdırıb, hamilə qadın qarnının kəmər nahiyəsinə çəksə, uşaq salmaqdan əmin ola bilər.

• Bir ədəd açılmış gülü yeddi rəngli yun sapla kitaba sarıyıb epilepsiyası olan uşağa göstərsən, sağalar.

• Türk paxlasını kükürdlə bişirib bir yerə səpdikdə, o yerə külüng dəyən kimi parçalanır.

• Söyləyirlər ki, ərəbcə "Səmmi-Əhmək", türkcə "Sığır quyruğu" adlandırılan mahizöhrəc bitkisini döyüb suya tökdükdə balığı bihuş edir və o, suyun üzərinə çıxıb ölür.

## LÜĞƏT

Aqirqəhra – anasiklüs (*anacyclus*)
Bəvasir – babasil
Burə - boraks, bura
Dirhəm – 3,12 qrama bərabər olan çəki ölçüsü
Əsarun – Avropa çobandüdüyü (*asarum europaeum*)
Kafur – kamfora ağacının qatılaşmış şirəsi (*Cinnfmomum camphora L.*)
Kasnı – kasnı (*Cichorium sp.*)
Kəbabə – Çin istiotu (*piper subeba*)
Ləğvə – üz sinirinin iflici (*parez*)
Məviz – üzüm növü (*Vitis sr.*)
Nərcis – nərgiz
Nüğrüs – podaqra xəstəliyi; bədəndə maddələr mübadiləsinin pozulması nəticəsində əmələ gələn oynaq və toxuma xəstəliyi
Səqminiyə – ot sarmaşığı (*convolvulus scammonea*)
Şitərəc – enliyarpaq bozalaq (*lipedium latifforium*)
Tibet müşkü - Cənubi Sibir və Çində yayılmış maralın qarın vəzisindən alınan maddə
Zəngar – mis karbonatı



## MÜNDƏRİCAT

| | |
|---|---|
| Buraxılışa məsul: | *Əziz Güləliyev* |
| Texniki redaktor: | *Rövşən Ağayev* |
| Tərtibatçı-rəssam: | *Nərgiz Əliyeva* |
| Kompyuter səhifələyicisi: | *Rəvan Mürsəlov* |
| Korrektor: | *Fəridə Səmədova* |

Yığılmağa verilmişdir 04.08.2006. Çapa imzalanmışdır 09.11.2006.
Formatı 60x90 $^1/_{16}$. Fiziki çap vərəqi 13,5. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 220.

Kitab "Şərq-Qərb" mətbəəsində çap olunmuşdur.
Bakı, Aşıq Ələsgər küçəsi, 17.